AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ · 1921

QƏZET 1958-ci İLDƏN NƏŞR OLUNUR

# GƏNC MÜƏLLİM

*Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram.*
*Heydər ƏLİYEV*

May 2019
№ 05 (1102)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



2019-cu ilin may ayında Azərbaycanın Xalq yazıçısı Hüseyn Məmmədəli oğlu İbrahimovun anadan olmasının 100 illiyi tamam olur.

## Hüseyn İbrahimovun 100 illik yubileyinin qeyd edilməsi haqqında
## *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

Hüseyn İbrahimov yarım əsrdən artıq bir dövrü əhatə edən səmərəli ədəbi fəaliyyəti ilə müasir Azərbaycan ədəbiyyatının inkişafına töhfələr vermiş özünəməxsus yaradıcılıq üslubuna malik simalardandır. Ədibin uğurlu axtarışlarının nəticəsi kimi müxtəlif janrlarda meydana gətirdiyi əsərlərdə müasirlərimizin zəngin mənəvi aləmi dolğun əks etdirilmiş, mədəniyyət tariximizin yetirdiyi bir çox görkəmli simaların işıqlı obrazları parlaq bədii boyalarla təcəssümünü tapmışdır. Uzun illər Naxçıvanın ictimai-siyasi həyatının fəal iştirakçısı olmaqla Hüseyn İbrahimov regionda mədəni mühitin tarixi ənənələrinin qorunub saxlanılması və eləcə də müstəqillik ideallarına sadiq yaradıcı ədəbi qüvvələrin öz potensiallarını lazımınca gerçəkləşdirə bilmələri üçün böyük əmək sərf etmişdir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq və Azərbaycan ədəbiyyatı qarşısında xidmətlərini nəzərə alaraq, Xalq yazıçısı Hüseyn İbrahimovun anadan olmasının 100-cü ildönümünün qeyd olunmasını təmin etmək məqsədi ilə qərara alıram:

1. Azərbaycan Respublikasının Mədəniyyət Nazirliyi, Azərbaycan Yazıçılar Birliyinin təkliflərini nəzərə almaqla, Xalq yazıçısı Hüseyn İbrahimovun 100 illik yubileyinə dair tədbirlər planını hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 18 may 2019-cu il*

## Adlı təqaüdlərə layiq görülən tələbələrlə görüş

Mayın 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) semestri ən yüksək nəticə ilə başa vuraraq adlı təqaüdə layiq görülən tələbələrlə görüş keçirilib. Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev, Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev, fakültə dekanları və tələbələr iştirak ediblər.




ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək bildirib ki, Elmi Şuranın 14 sentyabr 2018-ci il tarixli iclasının qərarı ilə adlı təqaüdlər təsis edilib. Elmi Şuranın 24 oktyabr 2018-ci il tarixli iclasının qərarı ilə ADPU-da adlı təqaüdlər haqqında Əsasnamə təsdiq edilib. Elmi Şuranın 25 dekabr 2018-ci il tarixli qərarı ilə təsis edilmiş adlı təqaüdlərin məbləği fakültələr üzrə müəyyən edilib. Rektor qeyd edib ki, bu, universitetin bu sahədə gördüyü ilk işdir. Hər bir xalq, millət özünün görkəmli şəxsiyyətləri ilə tanınır. Siz bizim ən yaxşı tələbələrimizsiniz. Siz çalışmalısınız ki, həmişə ən yaxşı olasınız. Mən inanıram ki, bu cür gəncliyi olan xalq, millət həmişə öndə olacaq. Çalışmalıyıq ki, təhsilimiz Azərbaycanın bu gününə və gələcəyinə uyğun səviyyəyə gəlib çatsın. Universitetimiz müəllim hazırlığının mərkəzi hesab edilir. Ulu öndər Heydər Əliyevin müəllimlik peşəsi haqqında dediyi sözlər öz xüsusi dəyəri və əhəmiyyəti ilə seçilir: "Mən Yer üzündə müəllim adından yüksək ad tanımıram!"

Qeyd edək ki, adlı təqaüdlərə layiq görülmüş tələbərimiz aşağıdakılardır:

1. Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin "Korreksiyaedici təlim" ixtisasının III tədris ilinin tələbəsi Günay Qəribova -Heydər Əliyev adına təqaüd;

2. Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin "Təhsildə sosial-psixoloji xidmət" ixtisasının III tədris ilinin tələbəsi Leyla Kərimova -Abdulla Şaiq adına təqaüd;

3. Fizika və texnologiya fakültəsinin "Fizika müəllimliyi" ixtisasının III tədris ilinin tələbəsi Günel İmaməliyeva - akademik Həsən Abdullayev adına təqaüd;

4. Riyaziyyat və informatika fakültəsinin "Riyaziyyat və informatika müəllimliyi" ixtisasının III tədris ilinin tələbəsi Aysel Abbaszadə -akademik Zahid Xəlilov adına təqaüd;

5. Filologiya fakültəsinin "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisasının III tədris ilinin tələbəsi Arifə Ağayeva- Nizami Gəncəvi adına təqaüd;

6. Kimya və biologiya fakültəsinin "Biologiya müəllimliyi" ixtisasının IV tədris ilinin tələbəsi Bilman Sayadov -akademik Yusif Məmmədəliyev adına təqaüd;

7. Tarix və coğrafiya fakültəsinin "Tarix və coğrafiya müəllimliyi" ixtisasının III tədris ilinin tələbəsi Zərifə İsmayılova - Abasqulu ağa Bakıxanov adına təqaüd;

8. Tarix və coğrafiya fakültəsinin "Coğrafiya müəllimliyi" ixtisasının III tədris ilinin tələbəsi Nərgiz Məmmədova - Qafur Rəşad Mirzəzadə adına təqaüd;

9. İbtidai təhsil fakültəsinin "İbtidai sinif müəllimliyi" ixtisasının III tədris ilinin tələbəsi Könül Həsənova -akademik Mehdi Mehdizadə adına təqaüd;

10. Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin "Təsviri incəsənət müəllimliyi" ixtisasının III tədris ilinin tələbəsi Elnarə Rəhimova -Üzeyir Hacıbəyli adına təqaüd;

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev və Tədris Departamentinin direktor, dosent Sənan Əliyev tələbələri təbrik edərək onlara uğurlar arzulayıblar.

Tələbə-gənclər çıxış edərək göstərilən diqqət və qayğıya görə universitetin rəhbərliyinə öz minnətdarlıqlarını bildiriblər.

Sonda xatirə şəkli çəkdirilib.

**Mənsur İbrahimli**

## "Heydər Əliyev və Azərbaycanda intellektual potensialın davamlı inkişafı" Respublika elmi konfransı

Mayın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU), Səbail Rayon İcra Hakimiyyətinin (RİH) və Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının birgə təşkilatçılığı ilə universitetdə "Heydər Əliyev və Azərbaycanda intellektual potensialın davamlı inkişafı" Respublika elmi konfransı keçirilib. Konfransda öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.



Konfransı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, mayın 10-da müasir Azərbaycanın qurucusu, ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 96-cı ildönümü tamam olur. Bu münasibətilə ölkəmizdə və bir çox xarici ölkələrdə müxtəlif tədbirlər keçirilir. Bizim bu gün birgə keçirdiyimiz "Heydər Əliyev və Azərbaycanda intellektual potensialın davamlı inkişafı" Respublika elmi konfransı da ulu öndər Heydər Əliyevin anadan olmasının 96-cı ildönümünə həsr olunub.

Rektor qeyd edib ki, xalqımızın müdrik oğlu Heydər Əliyevin respublikamıza rəhbərlik etdiyi 1969-1982-ci illər Azərbaycan təhsilinin intibah dövrü kimi səciyyələndirilir. Ulu öndər Heydər Əliyevin Azərbaycanda birinci dəfə rəhbər seçilməsinə qədər texniki peşə məktəblərində cəmi 20 min gənc təhsil alırdı. Heydər Əliyev ölkəyə rəhbər seçildikdən sonra isə onların sayı 90 minə çatdı, bütün rayonlarda texniki-peşə məktəbləri yaradıldı. 1969-1982-ci illərdə 1 milyon 500 min uşağın 1 milyon 100 mini yeni tikilmiş məktəblərdə təhsil almağa başladı. Həmin dövrdə məktəbəqədər tərbiyə müəssisələrinin sayı 1600-dən 1875-ə çatmışdı. Təkcə 1969-1982-ci illərdə Azərbaycanın şəhər, kənd və qəsəbələrində 700-ə qədər yeni məktəb binası tikilib istifadəyə verilmişdi. Heydər Əliyevin şəxsi təşəbbüsü və təşkilatçılığı ilə Azərbaycanda 1970-1982-ci illərdə 5 yeni ali təhsil müəssisəsi yaradılmış, ali məktəb tələbələrinin sayı isə 70 mindən 100 min nəfərə çatdırılmışdı. Qeyd etdiklərimlə yanaşı, Heydər Əliyev istedadlı azərbaycanlı gənclərin keçmiş SSRİ-nin qabaqcıl və nüfuzlu ali təhsil müəssisələrində təhsil almalarına da xüsusi diqqət yetirirdi. Ötən əsrin 80-ci illərinin əvvəllərində hər il 1000-1400 nəfər azərbaycanlı gənc respublikamızdan kənarda ali təhsil almağa göndərilirdi. Halbuki, 1969-cu il üçün həmin rəqəm cəmisi 47 idi. Məhz Ulu Öndərin şəxsi təşəbbüsü ilə 1970-1980-ci illərdə keçmiş SSRİ-nin 50-dən artıq böyük şəhərinin 170-dən çox nüfuzlu ali məktəblərində respublikamızın xalq təsərrüfatı, elm, təhsil və mədəniyyətinin 80-dən artıq sahəsini əhatə edən və zəruri ehtiyac duyulan 250-dən çox ixtisas üzrə 15 mindən artıq azərbaycanlı gənc ali təhsil almışdır. Heydər Əliyev həmin uzaqgörən siyasəti azərbaycanlı hərbi mütəxəssislərin yetişdirilməsi sahəsində də həyata keçirirdi. Təkcə 1982-ci ildə keçmiş Sovetlər Birliyinin ali hərbi məktəblərinə 550 nəfər azərbaycanlı gənc qəbul edilmişdi. Cəmşid Naxıçvanski adına Hərbi Liseyin, eləcə də ADPU-da İbtidai hərbi hazırlıq və fiziki təlim fakültəsinin yaradılması da Heydər Əliyevin vətənpərvər fəaliyyəti ilə bağlıdır.

Qüdrətli siyasi xadim Heydər Əliyev respublikamızda yenidən hakimiyyətə qayıtdıqdan sonra təhsil müəssisələrinin normal fəaliyyət göstərməsi və təhsilin milli tərəqqimizin əsas amilinə çevrilməsi üçün ölkəmizdə geniş islahatlar proqramı işlənib hazırlandı. Heydər Əliyev müəllim peşəsini yüksək qiymətləndirərək demişdir: "Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram". Ulu Öndərimizin bu fikri fəaliyyətimizin leytmotivini təşkil edir.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin xüsusi diqqət və qayğısı nəticəsində təhsil müəssisələri yeniləşir, inkişaf edir. Müasir dövrdə yüksəkixtisaslı mütəxəssislərin hazırlanması çox vacibdir. Bu baxımdan, bizim üzərimizə böyük məsuliyyət düşür. Müəllim hazırlığı ölkəmizin milli təhlükəsizliyi məsələsidir. Biz Azərbaycan məktəblərini yüksək səviyyəli pedaqoji kadrlarla təmin etmək üçün əzmlə, fədakarlıqla çalışmalı, bu istiqamətdə bütün səylərimizi gücləndirməliyik.

YAP-ın Səbail rayon təşkilatının sədri, professor Şəmsəddin Hacıyev çıxış edərək Heydər Əliyevin xalqımız və dövlətimiz qarşısında böyük tarixi xidmətləri haqqında geniş danışıb. Professor Ş.Hacıyevin çıxışında Heydər Əliyevin Azərbaycana rəhbərlik etdiyi bütün dövrlərdə ölkəmizin qazandığı böyük uğurlar, sürətli inkişaf konkret faktlar, rəqəmlər əsasında öz dolğun əksini tapıb.

Səbail RİH-in başçısının müavini Eldar Ağayev çıxışında qeyd edib ki, biz bu gün həyatımızın bütün sahələrində Heydər Əliyevin gərgin əməyini, böyük xidmətlərini görürük. Heydər Əliyev dahi şəxsiyyət, uzaqgörən lider idi. Heydər Əliyev həmişə xalqına, millətinə ləyaqətlə, fədakarlıqla xidmət göstərib. Dövlət başçımız cənab İlham Əliyevin Heydər Əliyevin dövlətçilik strategiyasını uğurla davam etdirməsi nəticəsində ölkəmiz sürətlə inkişaf edir, beynəlxalq siyasi nüfuzu artır.

Konfransda Heydər Əliyevin və Azərbaycan Prezidenti İlham Əliyevin elm və təhsillə bağlı fikirlərini əks etdirən videoçarx nümayiş etdirilib.

Konfransda Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov "Heydər Əliyev və Azərbaycan elmi" mövzusunda, Filologiya fakültəsinin Azərbaycan dilçiliyi kafedrasının müdiri, professor Nizami Xudiyev "Azərbaycan dilinin inkişafında Heydər Əliyevin rolu" mövzusunda məruzələrlə çıxış ediblər. Geniş və maraqlı məruzələrdə Heydər Əliyevin elmin, təhsilin inkişafındakı əvəzsiz rolundan, eləcə də Azərbaycan dilinin qorunmasında və təbliğində göstərdiyi böyük xidmətlərdən danışılıb.

ADPU-nun rektorunun müşaviri, professor Vilayət Əliyev, YAP-ın Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk təşkilatının sədri, professor Himalay Qasımov, Ümumi tarix kafedrasının müdiri, AMEA-nın müxbir üzvü, professor Vəli Əliyev çıxış edərək Heydər Əliyevin böyük tarixi xidmətləri ilə bağlı öz fikirlərini bölüşüblər.

**Günay Bağırlı**

# Ümummilli lider Heydər Əliyevin anadan olmasının 96-cı ildönümünə həsr olunan şahmat turniri



Mayın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) II nömrəli tədris binasında universitetin Heydər Əliyev Mərkəzinin xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 96-cı ildönümünə həsr etdiyi "Şahmatın inkişafı və təbliği" layihəsi çərçivəsində şahmat turnirinin açılış mərasimi keçirilib. Açılış mərasimində ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, müəllim və tələbələr iştirak ediblər. Tədbirdə öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib və ulu öndər Heydər Əliyevin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Tədbiri giriş sözü ilə açan layihənin rəhbəri, Heydər Əliyev Mərkəzinin baş mütəxəssisi Aytən Daşdəmirova bildirib ki, xalqımız hər il mayın 10-da görkəmli dövlət xadimi, müasir Azərbaycan dövlətinin qurucusu, ulu öndər Heydər Əliyevin doğum gününü qeyd edir. Hələ sağlığında əfsanələşmiş Heydər Əliyevin həyat və fəaliyyəti doğma xalqına xidmət, yüksək dəyərlərə sədaqət meyarı olmuşdur. Ulu öndər Heydər Əliyev həsəd aparılacaq bir ömür yaşadı. Xalqımızı ən yüksək məqama - müstəqilliyə qovuşdurdu. Dünyada insanın Vətənin timsalına çevrilməsi nadir hadisələrdəndir.



Məhz ümummilli lider Heydər Əliyev dünyada bu yüksək zirvəyə çatan qüdrətli şəxsiyyətlərdən biri oldu. Heydər Əliyev Azərbaycanın müasir dövrünün yeni intibah mərhələsinin banisidir. Bu gün ölkəmizə Heydər Əliyev yolunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev rəhbərlik edir. Dövlət başçımız İlham Əliyev dünya azərbaycanlılarının lideridir.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxışında qeyd edib ki, qədirbilən xalqımız həmişə ulu öndər Heydər Əliyev şəxsiyyətini uca tutur, Onun əziz xatirəsi daim bizim qəlbimizdədir. Azərbaycanda dövlət gənclər siyasətinin əsası ulu öndər Heydər Əliyev tərəfindən qoyulub. Heydər Əliyev Azərbaycan gənclərinin bilikli, savadlı, vətənpərvər, milli-mənəvi dəyərlərimizə sadiq olmalarını arzulayırdı.Eyni zamanda Ulu Öndər gənclərə Azərbaycanın dövlət müstəqilliyinin qorunmasını, daha da gücləndirilməsini tövsiyə edirdi. ADPU-da ulu öndər Heydər Əliyevin anadan olmasının 96-cı ildönümü münasibətilə silsilə tədbirlər keçirilir. Bugünkü şahmat yarışı da həmin silsilə tədbirlər çərçivəsində keçirilən bir tədbirdir. Belə yarışlar gənclərin intellektual səviyyəsinin artırılmasına xidmət edir. Gənclərimiz yaxşı təhsil almaqla yanaşı, fiziki sağlamlıqlarına da xüsusi diqqət yetirməli, asudə vaxtlarını maraqlı və səmərəli keçirməlidirlər. Gənclərimiz həm fiziki, həm də əqli cəhətdən güclü olmalıdırlar. Rektor çıxışının sonunda yarış iştirakçılarına uğurlar arzulayıb.



Açılış mərasimindən sonra şahmat turniri keçirilib. 16 ən güclü tələbə arasında keçirilən şahmat turnirində 1-ci yeri Bəhrəm Şamiyev, 2-ci yeri Bəxtiyar Aslanov, 3-cü yeri Ramil Ramizov tutub. Qeyd edək ki, I yerin qalibi olan Bəhrəm Şamiyevə 100 manat pul mükafatı və kubok, II yerin qalibi olan Bəxtiyar Aslanova 50 manat pul mükafatı və medal, III yerin qalibi olan Ramil Ramizova 30 manat pul mükafatı və medal verilib. Digər iştirakçılara isə təşəkkürnamələr təqdim edilib.

**Orxan Abdullayev**

# "Gələcəyin müəllimi" I Açıq Musiqi Müsabiqəsinin qaliblərinin mükafatlandırılması mərasimi və qaliblərin konserti

Mayın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin (ADMİU) və ADPU-nun birgə təşkilatçılığı ilə xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 96-cı ildönümünə həsr olunmuş və Azərbaycanda ilk dəfə "Musiqi müəllimliyi" ixtisası üzrə keçirilən "Gələcəyin müəllimi" I Açıq Musiqi Müsabiqəsinin qaliblərinin mükafatlandırılması mərasimi və qaliblərin konserti keçirilib.



Tədbirdə ADPU-nun və ADMİU-nun rəhbərliyi, müəllimləri və tələbələri iştirak ediblər. Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

Tədbirdə Münsiflər Heyəti tərəfindən ADPU-nun və ADMİU-nun müsabiqənin iştirakçısı olan 41 nəfər tələbəsinə sertifikatlar təqdim edilib. Müsabiqədə fərqlənən iştirakçılara isə həvəsləndirici mükafatlar və diplomlar verilib.



Konsertdə ADMİU-nun tələbəsi Aydan Tağıyeva Qara Qarayevin "İnsan məskən salır"kinofilmindən musiqi parçasını, ADPU-nun tələbələri Aygün Ağayeva, İsa Adıgözəlov Montinin "Çardaş" əsərini, ADPU-nun tələbələri Aygün Abaszadə, Ləman Ağazadə Emin Sabitoğlunun "Uzaq yaşıl ada"mahnısını, ADMİU-nun tələbələri Aysel Şirinova, Leyla Qasımova Q.Sviridovun "Vals" əsərini, ADPU-nun tələbələri Leyla Həsənli, Etibar İsmayılov zərb muğamı olan "Heyratı"nı, ADPU-nun tələbəsi Çinarə Quliyeva Qara Qarayevin "Prelyüd N 7" əsərini, ADMİU-nun tələbəsi İlahə Abbaszadə və Azərbaycan Milli Konservatoriyasının tələbəsi Elşən Məmmədov E.Kurtisanın "Non Ti Seordar Di Me" əsərini, ADMİU-nun tələbələri Leyla Əliyeva, Sevinc Rzayeva Polad Bülbüloğlunun "Döyüşçülərin rəqsi" əsərini, ADPU-nun tələbəsi Lalə Ağayeva Cövdət Hacıyevin "Ballada"sını, ADPU-nun Musiqi və onun tədrisi metodikası kafedrasının dosenti, Əməkdar incəsənət xadimi Nailə Mirməmmədli və tələbəsi Məxfirət Hüseynova Uitni Hyustonun "Mən həmişə səni sevəcəyəm" mahnısını, ADMİU-nun tələbələri Leyla Aslanova, Fidan Məmmədzadə A.Piazollanın "Libertango"sunu, bədii rəhbəri dosent Təranə Yusifova olan ADMİU-nun Vokal ansamblı Qara Qarayevin "Gənclik mahnısı"nı ifa ediblər.

Qeyd edək ki, "Müəllim-tələbə" nominasiyası üzrə ADPU-nun tələbəsi Məxfirət Hüseynova və müəllimi, Əməkdar incəsənət xadimi Nailə Mirməmmədli I yerə, "Solo" nominasiyası üzrə ADPU-nun tələbələri Lalə Ağayeva və Leyla Həsənli I yerə, "Duet" nominasiyası üzrə ADPU-nun tələbələri Leyla Həsənli və Etibar İsmayılov I yerə, ADPU-nun tələbəsi Çinarə Quliyeva isə Qran-priyə layiq görülüblər.

Konsert hamıda yüksək əhvali-ruhiyyə yaradıb.

Biz də tələbələrimizi bu münasibətlə ürəkdən təbrik edir, onlara təhsildə və yaradıcılıqda yeni-yeni uğurlar arzulayırıq.

**Könül Nəzərova**



# "Təbiəti könüllü qoruyaq!" adlı könüllülər proqramının təqdimatı

Mayın 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Ekologiya və Təbii Sərvətlər Nazirliyi (ETSN) tərəfindən yaradılmış "Təbiəti könüllü qoruyaq!" adlı könüllülər proqramının təqdimatı keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, Nazirliyin məsul şəxsləri, universitetin struktur bölmələrinin müdirləri, müəllim və tələbələr iştirak ediblər.



Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, qarşıdan xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 96-cı ildönümü gəlir. Bizim bugünkü tədbirimiz Ulu Öndərin tövsiyələrinin icrasından irəli gələn bir tədbirdir. Vətəni qorumaq, gücləndirmək gənclər qarşısında dayanan əsas vəzifələrdən biridir. ADPU-nun tələbələri ölkəmizdə uğurla həyata keçirilən könüllülük hərəkatında fəal iştirak edirlər. Bu onların təcrübə qazanmalarına, vətəndaş kimi formalaşmalarına müsbət təsir edir. Rektor belə aktual mövzuda tədbirin keçirilməsinə görə ETSN-nin rəhbərliyinə təşəkkür edib.




Çıxış edən Ekologiya və təbii sərvətlər nazirinin müavini Firdovsi Əliyev tədbirin keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib və universitetin kollektivinə uğurlar arzulayıb. Qeyd edib ki, ADPU böyük tarixi ənənələrə malikdir. Özünün ADPU-nun məzunu olmasından qürur duyduğunu bildirən F. Əliyev vurğulayıb ki, müəllim peşəsi şərəfli, müqəddəs və məsuliyyətli peşədir. Müdriklərimiz "Sağlam bədəndə sağlam ruh olar" deyiblər. Sağlam ruhun yaranmasında isə ətraf mühitin böyük rolu var. ETSN dövlətin vahid ekologiya siyasətini həyata keçirir. Bu təqdimatı keçirməkdə əsas məqsədimiz ətraf mühit və təbii sərvətlərin qorunması istiqamətində təbliğat və maarifləndirmə işlərinin miqyasının daha da genişləndirilməsidir.

ETSN-nin Aparat rəhbəri Vüqar Kərimov çıxış edərək Nazirliyin strukturu və fəaliyyət istiqamətləri barədə geniş məlumat verib. Qeyd edib ki, Nazirlik təhsil müəssisələri ilə sıx əməkdaşlıq şəraitində fəaliyyət göstərir. V. Kərimov tələbələri ətraf mühitin qorunması istiqamətində birgə təbliğat aparmağa, "Təbiəti könüllü qoruyaq!" könüllülər proqramına qoşulmağa və əməkdaşlıq etməyə çağırıb.

İctimaiyyətlə əlaqələr və ekoloji təbligat şöbəsinin müdiri Səyyarə Məmmədova çıxışında tələbələrə proqramın məqsədi, iştirak qaydaları, imkanları və gənclərin belə layihələrə cəlb edilməsinin əhəmiyyəti barədə ətraflı məlumat verib. Bildirib ki, könüllülük fəaliyyətinə qoşulan gənclər ətraf mühit və təbii sərvətlərin qorunması istiqamətində aparılan təbliğat və maarifləndirmə işlərində yaxından iştirak edəcək, proqram çərçivəsində Nazirliyin mütəxəssisləri tərəfindən onlara əmək vərdişləri aşılayan təlimlər keçiriləcək və nəzəri-praktik biliklərin qazanılması üçün geniş şərait yaradılacaq. Proqramın məzunlarına xüsusi sertifikatlar veriləcək və onlar ehtiyat kadrlar siyahısına alınaraq gələcəkdə ETSN-də kadr heyətinin formalaşdırılmasında iştirak edəcəklər. Bu da gənc könüllülərin işlə təmin edilmələri üçün əlverişli fürsətdir.



Tədbirdə proqramla bağlı tələbələrin sualları ətraflı cavablandırılıb, maraqlı fikir mübadiləsi aparılıb.

Sonda rektor Cəfər Cəfərov tələbə-gənclərə "Təbiəti könüllü qoruyaq!" könüllülər proqramında fəal iştirak etməyi tövsiyə edib və onlara uğurlar arzulayıb.

**Mahirə Mustafayeva**

# Ulu öndər Heydər Əliyevin anadan olmasının 96-cı ildönümünə həsr olunan tədbir

Mayın 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) ulu öndər Heydər Əliyevin anadan olmasının 96-cı ildönümünə həsr olunan tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, şöbə müdirləri, müəllim və tələbələr iştirak ediblər. Tədbirdə öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq bildirib ki, bu günlər qədirbilən xalqımız müasir Azərbaycanın qurucusu, ulu öndərimiz Heydər Əliyevin anadan olmasının 96-cı ildönümü qeyd edir. ADPU Ulu Öndərə vəfa borcunu müxtəlif formalarda verir. Müstəqil Azərbaycan Heydər Əliyevin titanik fəaliyyətinin nəticəsidir.

Rektor qeyd edib ki, biz bu gün həyatımızın hansı sahəsinə diqqət yetirsək, xalqımızın bu böyük oğlunun fədakar əməyini, çoxcəhətli fəaliyyətini görürük. Dahi şəxsiyyət Heydər Əliyev hələ Sovetlər Birliyi dövründə Azərbaycana rəhbər seçilərkən ölkəmizi tənəzzüldən xilas etmiş, onu inkişaf yoluna çıxarmışdır. 1969-cu ilin iyul ayının 14-də Heydər Əliyevin Azərbaycana rəhbər seçilməsi ilə respublikamızın ictimai-siyasi, sosial-iqtisadi və elmi-mədəni həyatının yüksəlişi dövrü başlamışdır.



Ulu öndər Heydər Əliyev ölkəmizdə yenidən hakimiyyətə qayıtdıqdan sonra xalqımızın milli müstəqillik arzusunun bütövlükdə həyata keçirilməsini təmin etdi. Öz müdrik siyasəti, zəngin idarəçilik və dövlətçilik təcrübəsi sayəsində Azərbaycanın formal, nominal müstəqilliyini faktiki, hüquqi müstəqilliyə çevirdi. Ulu Öndər müstəqil dövlətimizi qurdu, gücləndirdi, onu dünya miqyasında tanıtdı, Azərbaycanı nüfuzlu və mötəbər beynəlxalq təşkilatların tamhüquqlu üzvü etdi.

Ümummilli liderimiz Heydər Əliyev Azərbaycanın müstəqil bir dövlət kimi yaşamasını təmin etmək üçün onu möhtərəm Prezidentimiz cənab İlham Əliyevə tapşırdı. Heydər Əliyevin müdrik siyasi məktəbinin layiqli davamçısı olan cənab Prezidentimiz İlham Əliyev də Ulu Öndərimizin xalqımız və dövlətimizlə bağlı ideallarına sadiqlik nümayiş etdirərək müstəqil dövlətimizi daha da gücləndirdi və inkişaf etdirdi. Cənab Prezidentimizin uzaqgörən və tərəqqipərvər siyasəti Azərbaycanı ictimai-siyasi sabitliyin qorunması və dinamik iqtisadi inkişaf baxımından regionun lider dövlətinə və əsas söz sahibinə çevirmişdir. Müstəqil Azərbaycan Heydər Əliyevin şah əsəridir. Biz bugünkü müstəqil, sürətlə inkişaf edən, dünya siyasətində və beynəlxalq münasibətlər sistemində öz layiqli yeri olan Azərbaycana görə Heydər Əliyevə borcluyuq.

Tarix və coğrafiya fakültəsinin Azərbaycan tarixi kafedrasının baş müəllimi Samirə Ramazanova və Tələbə Gənclər Təşkilatının sədr müavini Taleh Mirzəyev çıxış edərək bildiriblər ki, Heydər Əliyev dahi şəxsiyyət, uzaqgörən lider idi. Heydər Əliyev həmişə xalqına, millətinə ləyaqətlə, fədakarlıqla xidmət göstərib. Çıxışlarda Heydər Əliyevin Azərbaycana rəhbərlik etdiyi bütün dövrlərdə elmin, təhsilin, mədəniyyətin, gənclərin və qadınların inkişafına göstərdiyi xüsusi diqqət və qayğı öz dolğun əksini tapıb.





Tədbirdə ulu öndər Heydər Əliyevin həyat və fəaliyyəti haqqında, həmçinin müstəqillik dövründə qazanılan uğurlar barədə geniş məlumat verilib.

Tədbirdə "Ulu bir sərkərdə, ulu bir öndər" adlı şeir səslənib, Heydər Əliyev haqqında film nümayiş etdirilib, "Torpağın səsi" adlı musiqi və "Yaşa Azərbaycan!" adlı mahnı səslənib, "Azərbaycançılıq bir amildir" videoçarxı nümayiş olunub, türkiyəli tələbə Kadir Palalı Heydər Əliyev barədə şeir oxuyub.

**Nurlan Səmədov**

# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində "Heydər Əliyev və gənclik" adlı tədbir

Mayın 8-də Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində ümummilli lider Heydər Əliyevin anadan olmasının 96-cı ildönümünə həsr olunmuş "Heydər Əliyev və gənclik" adlı tədbir keçirilib. Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev, fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva, kafedra müdirləri, fakültənin əməkdaşları və tələbələri iştirak ediblər. Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlayıb.



Fakültənin dekanı Şəhla Əliyeva tədbir iştirakçılarını salamladıqdan sonra Ulu Öndərin Azərbaycan gənclərinin inkişafındakı rolundan, müstəqil Azərbaycanın memarının onlar üçün yaratdığı şəraitdən danışıb.

Sonra rektor Cəfər Cəfərov çıxış edərək ümummilli lider Heydər Əliyevin 1969 -cu ildən başlayaraq Azərbaycanın quruculuğundakı uzun və mübarizələrlə dolu həyat yolundan danışıb. Özünün dolğun və ətraflı çıxışında Azərbaycanın bugünkü inkişafı, dünya miqyasında qazandığı uğurlara nail olunmasında Ümummilli Liderin qoyduğu bünövrənin Onun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev tərəfindən uğurla davam etdirildiyini vurğulayıb. Rektorun çıxışı tədbir iştirakçıları tərəfindən böyük rəğbətlə qarşılanıb.

Tədbirdə "Məktəbəqədər təlim və tərbiyə ixtisası"nın I tədris ilinin tələbəsi Fəxriyyə Nəcəfli, III tədris ilinin tələbəsi Hüsna Məmmədli maraqlı məruzələrlə çıxış ediblər. II tədris ilinin tələbəsi Aysu Valehli Heydər Əliyevə həsr edilmiş "Ulu Öndər" adlı şeiri, I tədris ilinin tələbəsi Leyla Oruclu isə "Xalq Heydər söyləyəcək" adlı mahnını ifa ediblər. Tələbələrin ifaları tədbir iştirakçıları tərəfindən çox maraqla və səmimi qarşılanıb.

Tədbirdən sonra rektor Cəfər Cəfərov tələbələrlə görüşüb, onlarla söhbət edib, arzu və təkliflərini dinləyib, problemləri ilə maraqlanıb. Səmimi şəraitdə keçən görüş tələbələrin sevincinə səbəb olub.

# "Heydər Əliyev ideya-nəzəri irsinin öyrənilməsinin aktual problemləri" mövzusunda seminar

Ümummilli lider Heydər Əliyevin anadan olmasının 96-cı ildönümü münasibətilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Heydər Əliyev məktəbinin lektoriyasında tanınmış filosof alim, fəlsəfə üzrə fəlsəfə doktoru, dosent Əmirəli İsmayılovun "Heydər Əliyev ideya-nəzəri irsinin öyrənilməsinin aktual problemləri" mövzusunda seminarı keçirilib.

Azərbaycan Respublikasının Dövlət Himninin sədaları ilə başlayan seminarı giriş sözü ilə Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev açaraq ulu öndər Heydər Əliyevin Azərbaycan dövlətinin formalaşmasındakı, dövlət quruculuğu sahəsindəki gərgin əməyindən danışdı. Sonra ulu öndər Heydər Əliyevin əziz xatirəsi bir dəqiqəlik sükutla yad olundu.





Dosent Y.Alıyev qeyd etdi ki, ADPU-da ümummilli lider Heydər Əliyevin doğum günü ilə bağlı bir sıra silsilə tədbirlər həyata keçirilmişdir. Heydər Əliyev irsinin öyrənilməsi, onun müəllifi olduğu Azərbaycançılıq ideologiyasının gənclər arasında geniş təbliği olunmasına böyük ehtiyac olduğunu, seminar və mühazirələrin keçirilməsinə böyük ehtiyac olduğundan bugünkü seminarımıza da məhz ümummilli lider Heydər Əliyev irsinin dərin araşdırıcılarından olan filosof Əmirəli İsmayılovu dəvət etmişik.

Dosent Y.Alıyev Ulu Öndərin siyasi varisi, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Heydər Əliyev siyasətini layiqincə davam etdirdiyinə də xüsusi diqqət çəkərək bildirdi ki, artıq bu siyasət hər sahədə öz bəhrəsini verməkdədir.

Sonra dosent Y.Alıyev çıxış üçün sözü ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanova verdi. Professor A.Zamanov çıxışında tələbələri və məruzəçini salamlayaraq Ulu Öndərin təhsilə, elmə göstərdiyi xüsusi diqqət və qayğıdan danışdı. O qeyd etdi ki, Heydər Əliyev Azərbaycanın inkişaf strategiyasını intellektual potensial əsasında quraraq Azərbaycanı qısa müddətdə İttifaq dövlətləri arasında həm sənaye, həm də kənd təsərrüfatı sahəsində lider dövlətə çevirdi. Bu gün Azərbaycan dövləti sayları çox az olan kosmik ölkələrlə bir sırada dayanan orbitdə peykləri olan dövlətlərdən biridir. Təbii ki, Azərbaycanın bugünkü iqtisadiyyatının, dünyada artan nüfuzunun təməlində də Heydər Əliyev siyasəti dayanır.

Sonra söz məruzəçi dosent Ə.İsmayılova verildi. Ə.İsmayılov çıxışını Heydər Əliyevin həyat və fəaliyyətini mərhələli şəkildə təsnifatlara bölərək hissə-hissə təhlillər əsasında məruzə etdi. O bildirdi ki, Heydər Əliyev Azərbaycanı aqrar ölkədən sənaye ölkəsinə çevirmədi. Heydər Əliyev Azərbaycanda aqrar sahə ilə sənayenin vəhdətini, uzlaşmasını tətbiq etdi. Onun ən böyük nailiyyətlərindən biri də azərbaycanlı tələbələrin SSRİ-nin nüfuzlu ali təhsil müəssisələrinə təhsil almağa göndərilməsi oldu ki, bununla da Azərbaycanda yüzə yaxın yeni ixtisas sahələri açıldı. Bu uğurların ən böyüyü isə kondisioner zavodunun Bakıda tikilməsini təşkil etməsi oldu. Bu hadisə o dövr üçün həm siyasi, həm də iqtisadi qalibiyyət demək idi.

Məruzəçi həmçinin zəngin dünyagörüşünə malik Heydər Əliyevin layiqli ömür yolu haqqında tələbələrə bir çox nümunələr göstərdi. Məruzədən sonra dosent Ə.İsmayılov tələbələrin və iştirakçıların suallarını cavablandırdı.



Sonda dosent Y.Alıyev məruzəçi dosent Ə.İsmayılova maraqlı məruzə və örnək nümunələrə görə universitetin rəhbərliyi adından və tələbələr adından dərin təşəkkür və minnətdarlığını bildirdi.

# Avstriyanın Vyana Pedaqoji Universitetinin nümayəndəsi ilə görüş

Mayın 13-də Avstriyanın Vyana Pedaqoji Universitetinin prorektoru Andreas Weissenback Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) olub. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Fuad Tağızadə, şöbənin mütəxəssisləri Lətif Kəngərlinski və Günay Məhərrəmova iştirak ediblər.



Görüşdə rektor Cəfər Cəfərov universitetin tarixi, tədris prosesi, tələbə həyatı, qarşıda duran vəzifələr, aparılan islahatlar, ölkədə müəllim peşəsinə olan maraq və tələblər haqqında məlumat verib.

Görüşdə Avstriya ali təhsil müəssisələri ilə əməkdaşlıq imkanları da müzakirə edilib. Peşəkar müəllim yetişdirməyin əhəmiyyətindən, eləcə də Avstriyadakı ali təhsil müəssisələrindən, müəllim peşəsi üçün qoyulan tələblərdən bəhs edən Andreas Weissenback göstərilən diqqətə görə təşəkkürünü bildirib.

Sonda Andreas Weissenback ADPU-nun tədris binası ilə tanış olub.

# İmadəddin Nəsiminin 650 illik yubileyi münasibətilə ədəbi-bədii tədbir

Mayın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin Bakı şəhərinin Nəsimi rayonundakı 8 nömrəli tam orta məktəbdə pedaqoji təcrübə keçən tələbələrinin və orta məktəb şagirdlərinin iştirakı ilə böyük Azərbaycan şairi və mütəfəkkiri İmadəddin Nəsiminin 650 illik yubileyi münasibətilə ədəbi-bədii tədbir keçirilib.

Tədbiri giriş sözü ilə məktəbin direktoru Aytən Baxşəliyeva açıb. İmadəddin Nəsiminin həyat və yaradıcılığı haqqında Aytəkin Məmmədova və Kamran Məhərrəmov çıxış ediblər.

Pedaqoji təcrübədə olan tələbələrdən Sərəncam Vəliyeva, Zeynəb Səmədova, Elsun Qurbanlı, Nərgiz Sərdarlı, Siyasət Bəxtiyarlı, Kamran Məhərrəmov, Aytəkin Məmmədova Nəsimi şeirlərini bəlağətli bir dildə dinləyicilərə təqdim ediblər.

Tədbir musiqi sədaları altında başa çatıb.

Sonda filologiya üzrə elmlər doktoru, professor Tərlan Novruzov çıxış edib. Professor T.Novruzov tədbirin keçirilməsinə verdiyi dəstəyə görə məktəbin rəhbərliyinə təşəkkür edib və tələbələrə uğurlar arzulayıb.

# SƏLIS-in e-vətəndaş proqramının təqdimatı

**Mayın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının Sürətli Əlaqələndirmə və Layihələrin İdarəetmə Sisteminin (SƏLIS) e-vətəndaş proqramının təqdimatı keçirilib. Tədbirdə ADPU-nun və Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının rəhbərliyi, əməkdaşları, universitetin müəllim və tələbələri iştirak ediblər.**




Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov qonaqları salamlayıb və tədbirin keçirilməsinə görə Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının rəhbərliyinə təşəkkür edib. Rektor bildirib ki, son vaxtlar ölkədə mövcud olan xidmətlərin daha əlçatan olması ilə bağlı çoxsaylı tədbirlər həyata keçirilir. Ölkədə elektron hökumətin qurulması istiqamətində ciddi addımlar atılır. Dövlət bu sahədə məqsədyönlü və səmərəli fəaliyyət göstərir. Bu da şəffaflığın və ictimai nəzarətin təmin edilməsində mühüm rol oynayır. Elektron universitetlərin yaradılması da bu istiqamətdə atılan mühüm addımlardan biridir. Qeyri-hökumət təşkilatları vətəndaş cəmiyyətinin inkişafına öz töhfələrini verirlər. QHT-lər idarəetmənin yaxşı bir modelidir. Onlar cəmiyyətin problemlərinin həllində fəal iştirak edirlər. Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurası QHT-lərin ideya və təşəbbüslərinin dəstəklənməsi sahəsində üzərinə düşən vəzifələri layiqincə və uğurla yerinə yetirir.




Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının sədri, Milli Məclisin deputatı Azay Quliyev çıxışında təqdimatın keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib və universitetinin kollektivinə uğurlar arzulayıb. Qeyd edib ki, müəllim hazırlığının mərkəzi hesab edilən ADPU bizim üçün xüsusi əhəmiyyət kəsb edir. Bizim hər birimizin həyatında müəllimlər mühüm rol oynayırlar. ADPU-da həyata keçirilən islahatlar, yeniliklər, layihələr təqdirəlayiqdir.

Azay Quliyev çıxışında vurğulayıb ki, Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurası Prezident cənab İlham Əliyevin elektron hökumətinin inkişafı, dövlət qurumları tərəfindən göstərilən elektron xidmətlərin təkmilləşdirilməsi ilə əlaqədar imzaladığı fərman və sərəncamları rəhbər tutaraq, həyata keçirdiyi elektron xidmətlərin keyfiyyətini daha da yaxşılaşdırmaq, fəaliyyətində şəffaflıq, hesabatlılıq və ictimai iştirakçılıq əmsalını yüksəltmək məqsədilə 2019-cu ildə 13 yeni elektron xidməti istifadəyə verməyi nəzərdə tutur. Şura ilk dəfə olaraq 2019-cu il dördüncü qrant müsabiqəsi çərçivəsində ölkə vətəndaşlarını qeyri-hökumət təşkilatlarının layihələrinin maliyyələşdirilməsi ilə bağlı onlayn qiymətləndirməyə dəvət edir. Bu məqsədlə Şura SƏLIS-in e-vətəndaş proqramını gerçəkləşdirir. Biz layihələrin elektron qəbul edilməsi və qiymətləndirilməsi prosesinə vətəndaşları cəlb etməyi planlaşdırırıq. Bu da öz növbəsində layihələrin qiymətləndirilməsində ictimai nəzarəti təmin edəcək.

Tədbirdə Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının Katibliyinin aparıcı məsləhətçisi Bəhram Bayramlının təqdimatında e-vətəndaş xidməti barədə hazırlanmış videoçarx nümayiş etdirilib, həmçinin Katibliyinin məsləhətçisi Elnur Bağırlının e-vətəndaş proqramından istifadə qaydalarının təqdimatı dinlənilib, proqramdan istifadə qaydaları əyani nümayiş etdirilib.

Sonda tədbir iştirakçılarının proqramla bağlı sualları cavablandırılıb.

**Günay Ramizqızı**



# "Elektron Universitet" layihəsi çərçivəsində tədbir




Mayın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Elektron Universitet" layihəsi çərçivəsində tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, şöbə və bölmə müdirləri, universitetin informasiya-kommunikasiya texnologiyaları sahəsində fəaliyyət göstərən əməkdaşları və layihə üzrə məsul şəxslər iştirak ediblər.







Tədbiri giriş sözü ilə açan ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov bildirib ki, artıq 2 ilə yaxındır ki, Təhsil Nazirliyinin tövsiyəsi əsasında və "Neuron Technologies" Məhdud Məsuliyyətli Cəmiyyətinin iştirakı ilə "Elektron Universitet" layihəsi həyata keçirilir. Bu layihə tədris prosesinin elektron formada qurulmasını nəzərdə tutur. Qeyd edilən müddət ərzində ADPU bu sahədə müəyyən bir səviyyə gəlib çatıb. Gələcəkdə layihə filiallar da daxil olmaqla, bütün universitetdə tətbiq ediləcək. ADPU-nun müasir universitetə çevrilməsi üçün bu layihə olduqca vacibdir.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxışında qeyd edib ki, universitet inkişaf edir, yeniləşir, müasirləşir. Bu inkişafın davam etməsi üçün "Elektron Universitet" layihəsinin həyata keçirilməsi bizim qarşımızda dayanan əsas vəzifələrdən biridir. "Elektron Universitet" layihəsi çox vacib bir layihədir. Bu layihə ADPU-da tədris prosesinin çevik, şəffaf və səmərəli idarə edilməsinə şərait yaradır.

Sonra tədbir prorektor E.Aslanovun moderatorluğu ilə davam edib. Dosent E.Aslanovun çıxışında fakültələrdə "Elektron Universitet" layihəsi çərçivəsində görülən işlər, gerçəkləşən tədbirlər haqqında konkret məlumatlar öz əksini tapıb. Həmçinin onun çıxışında layihənin miqyasının gələcəkdə daha da genişlənəcəyi xüsusi vurğulanıb.

"Neuron Technologies" Məhdud Məsuliyyətli Cəmiyyətinin əməkdaşı Mədinə Məmmədova tədbir iştirakçılarının suallarını cavablandırıb.

Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, Tədris Departamentinin Elektron qeydiyyat bölməsinin müdiri Tale Talıbov və başqaları çıxış edərək "Elektron Universitet" layihəsinin uğurla gerçəkləşməsi, elektron jurnalların tətbiqi və layihənin daha da genişlənməsi ilə bağlı fikir və mülahizələrini bölüşüblər.

**Mənsur Qüdrətoğlu**



# "Vətən, xalq və din - gələcəyin müəllimləri nələrə diqqət etməlidirlər" mövzusunda elmi seminar



Mayın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) təşkilatçılığı ilə Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin (DQİDK) sədr müavini Gündüz İsmayılovun təqdimatında universitetin tələbələri üçün "Vətən, xalq və din - gələcəyin müəllimləri nələrə diqqət etməlidirlər" mövzusunda elmi seminar təşkil edilib. Elmi seminarda ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin baş mütəxəssisi Sahil Qələndərov, TGT-nin sədr müavini, layihə rəhbəri Taleh Mirzəyev və tələbələr iştirak ediblər.

Çıxış edən rektor Cəfər Cəfərov tədbir iştirakçılarını salamlayaraq gənclərin elmi diskussiyalara marağının artırılması istiqamətində tələbələrin özlərindən gələn belə təşəbbüslərin təqdirəlayiq hal olduğunu qeyd edərək mənəvi-dini biliklərin düzgün aşılanması və mahiyyətinin dərk edilməsi mövzusunun müəllim olacaq gənclər üçün xüsusi mühüm əhəmiyyət kəsb etdiyini vurğulayıb.

Prorektor Fikrət Rzayev çıxışında müxtəlif mövzularda təşkil olunan belə seminarların bir layihə halında 2018-ci ilin noyabr ayından ardıcıl keçirildiyini diqqətə çatdıraraq bunun bir növ tələbələr üçün könüllü ustad dərsi xarakteri daşıdığını deyib.

Din, əxlaq, milli mənsubiyyət, cəmiyyətdəki ictimai fikirlər və onların qarşılıqlı əlaqəsi, İslam dini, onun bir məntiqi sistem kimi əsas məqsəd və hədəfləri, müasir gəncliyin bu proseslərdə əsas informasiya mənbələri, din və cəmiyyət münasibətlərində dövlətin tənzimləmə funksiyası, dini biliklərin verilməsi və digər məqamlarla bağlı tələbələrlə geniş müzakirə aparan Komitənin sədr müavini Gündüz İsmayılov əhatəli təqdimatla çıxış edərək gənclərə azərbaycanlı kimliyimiz çərçivəsində dini inancımızı müasir intellektual səviyyəyə malik gənclik kimi yaşamalı olduğumuzu vurğulayıb. O, qeyd edib ki, bu bizim həyat tərzimizdir, bunu anlamaq üçün təkcə Azərbaycan bayrağındakı məna çalarlarına baxmaq ən bariz nümunədir. Milli və dini kimliyimizi qarşı-qarşıya qoymaq cəhdləri isə sanki ağacın kökünü inkar edib gövdəni qabartmaq kimi məkrli və təhlükəli bir əməldir.

Sonda tələbələrin sualları cavablandırılıb.

**Orxan Fəxrəddinoğlu**

# Tələbə qızlar arasında keçirilən voleybol yarışı başa çatıb

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Həmkarlar İttifaqı Komitəsinin təşkilatçılığı ilə mayın 6-dan başlayan və 8 komandadan ibarət olan tələbə qızlar arasında keçirilən voleybol yarışı mayın 14-nə qədər davam edib. Mayın 16-da isə bu yarışın yarımfinal və final mərhələləri keçirilib. Qeyd edək ki, "A" və "B" qrupları üzrə keçirilən yarışın yarımfinalında 3-cü yer uğrunda Kimya və biologiya fakültəsinin və Riyaziyyat və informatika fakültəsinin komandaları, finalında isə Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin və Fizika və texnologiya fakültəsinin komandaları mübarizə aparıblar. Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin komandası 1-ci yeri, Fizika və texnologiya fakültəsinin komandası 2-ci yeri, Kimya və biologiya fakültəsinin komandası isə 3-cü yeri tutub.



Final yarışında ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev, Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev, Fizika və texnologiya fakültəsinin dekanı, dosent Arzu Daşdəmirov, Fiziki tərbiyə və çağırışaqədər hazırlıq kafedrasının müdiri Eldar Abdullayev, İdman Klubunun müdiri Araz Xəlilov və başqaları iştirak ediblər.

**Nurlan İftixaroğlu**





# Fizika və texnologiya fakültəsində “Bir gün rəhbər olsaydım...” layihəsi

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsinin ideyası olaraq fakültə Elmi Şurasının qərarı ilə mayın 15-də fakültədə “Bir gün rəhbər olsaydım...” layihəsi həyata keçirilib. Layihə çərçivəsində fakültənin idarə edilməsi bir günlük tələbələrə həvalə edilib. Dekan, dekan müavini, kafedra müdirləri, Tədris-Metodiki Şuranın (TMŞ) sədri, Tələbə Elmi Cəmiyyətinin (TEC) sədri və tyutor vəzifələrinə ilk olaraq tələbələr ərizələri ilə müraciət edərək namizədliklərini verib, sonra isə ümumi səsvermə yolu ilə müvafiq strukturlara seçiliblər.**

Fakültənin dekanı, dosent Arzu Daşdəmirov, dekan müavini, dosent Xankişi Məmmədov, Ümumi fizika kafedrasının müdiri, dosent Cahangir Hüseynov, Fizikanın tədrisi metodikası kafedrasının müdiri, dosent Sevinc Cəlilova, Texnologiya və onun tədrisi metodikası kafedrasının müdiri, dosent Səadət Musayeva, TMŞ-nin sədri, professor Həmzə Seyidli, TEC-in sədri, dosent Xatirə Adıgözəlova, tyutorlar Tuti Abdullayeva, Gülbəniz Rüstəmova, Aygün Əliyeva və Vəfa Abdurəhmanova layihə çərçivəsində öz işlərinin icrasını bir günlük bu tələbələrə həvalə ediblər:

*Fakültə dekanı - “Fizika müəllimliyi” ixtisasında təhsil alan 301-ci qrup tələbəsi Mülki Yusifli;*

*Dekan müavini - “Fizika müəllimliyi” ixtisasında təhsil alan FZM 1802 B qrup tələbəsi Kənan Ağakişiyev, “Texnologiya müəllimliyi” ixtisasında təhsil alan 303 T qrup tələbəsi Arzu Axundova və “Texnologiya müəllimliyi” ixtisasında təhsil alan TEX 1802 B qrup tələbəsi Elvin Quliyev;*

*ÜFK müdiri - “Fizika müəllimliyi” ixtisasında təhsil alan 203 F qrup tələbəsi İzzət Əmrahov;*

*FTM kafedrasının müdiri - “Fizika müəllimliyi” ixtisasında təhsil alan FZM 1803 B qrup tələbəsi Nərgiz Musayeva;*

*Texnologiya və OTM kafedrasının müdiri - “Texnologiya müəllimliyi ixtisasında təhsil alan 303 T qrup tələbəsi Aysel Dadaşlı;*

*TMŞ sədri - “Fizika müəllimliyi” ixtisasında təhsil alan FZM 1803 B qrup tələbəsi Gülarə Cəbrayılova;*

*TEC sədri - “Fizika müəllimliyi” ixtisasında təhsil alan 202 F qrup tələbəsi Nəzrin Göyüşlü;*

*Tyutorlar: Şəbnəm Aşurlu (II tədris ili)*
*Leyla Mirzəzadə (II tədris ili)*
*Sahibə Cəbrayılova (II tədris ili)*



*Leyla Manafova (II tədris ili)*
*Fatimə Nuri (II tədris ili)*

Seçilmiş tələbələrə səhər saat 08:20-dən saat 18:00-a qədər bir günlük iş fəaliyyətlərinə başlamaq üçün otaqların açarları təhvil verilib və həmin tələbələr öz vəzifələrinin icrasına başlayıblar.

Layihəyə dəstək nümayiş etdirərək tələbə idarəetməsini izləmək üçün ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev, Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev fakültəyə gəliblər. Rektor Cəfər Cəfərov layihəni dəstəklədiyini bildirib və davamlı olmasını arzu edib.

Müxtəlif vəzifələrə təyin olunmuş tələbələrlə səmimi söhbət edən rektor tələbələrin yazılı surətdə müraciət etdikləri suallara da cavab verib. Sonra rektor və digər rəhbər işçilər layihə çərçivəsində bir gün idarəedici struktura təyin edilmiş tələbələrlə fakültəni gəzərək auditoriyalarla və laboratoriyalarla yaxından tanış olublar. Rektor Cəfər Cəfərov vəzifələrini icra edən gənc rəhbərlərə öz tövsiyələrini verib.

Daha sonra tələbə-dekan kafedra müdirlərinin iştirakı ilə iclas keçirib, müəllim və tələbələrin müraciətlərini dinləyərək müəyyən qərarlar verib. Gün ərzində kafedralarda iclaslar keçirilib.

İş günü başa çatdıqdan sonra layihə çərçivəsində seçilmiş icraedici strukturların hesabat iclası keçirilib. İclasda bu tələbələrlə yanaşı, fakültənin dekanı və kafedra müdirləri də iştirak ediblər. Seçilmiş tələbələr gün ərzində gördükləri işlər haqqında məlumat verərək rektora ünvanlanan hesabatlarını təqdim ediblər və bu işlərin çətin, eləcə də məsuliyyətli bir iş olduğunu vurğulayıblar.

Sonda fakültənin dekanı, dosent A.Daşdəmirov işlərinin öhdəsindən bacarıqla gəldiklərinə görə tələbələrə təşəkkür edib.

**Mahirə Məhərrəmqızı**

# “Türkologiya: reallıqlar, problemlər, perspektivlər” Respublika elmi konfransı

**Mayın 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) “Türkologiya: reallıqlar, problemlər, perspektivlər” Respublika elmi konfransı keçirilib. Konfransda ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, şöbə müdirləri, ali təhsil müəssisələrinin, Azərbaycan Milli Elmlər Akademiyasının alim-mütəxəssisləri, tanınmış ziyalılar, müəllim və tələbələr iştirak ediblər.**



Konfransı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, bizim bu gün keçirdiyimiz respublika elmi konfransı türkologiya məsələlərinə həsr olunub. Ölkəmizdə türkologiya ilə bağlı müxtəlif tədbirlər keçirilir. Türkologiya elmi bizim üçün xüsusi əhəmiyyət kəsb edir. Çünki türkologiya elmi türk xalqlarının birliyini özündə ehtiva edir. Türkologiya elmi ictimaiyyət tərəfindən rəğbətlə qarşılanır. İnanıram ki, konfransın həm plenar iclasında, həm də bölmə iclaslarında aparılan müzakirələr bu sahədə olan ən son yeniliklərin ortaya qoyulmasına və qarşıda duran vəzifələrin müəyyən edilməsinə müsbət təsir edəcək.

Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova “Türkologiyanın aktual problemləri”, Müasir Azərbaycan dili kafedrasının müdiri, professor Buludxan Xəlilov “Türkologiyanın reallıqları və perspektivləri” mövzularında məruzələrlə çıxış ediblər. Geniş və maraqlı məruzələrdə qeyd edilib ki, türkoloji düşüncənin tarixi qədimdir. Azərbaycan dövləti türkoloji məsələlərə böyük dəyər verir. Türkoloji fikir dövlət siyasətinin mahiyyətində dayanır. Müasir dövrümüzdə türkdilli xalqlar arasında sosial-iqtisadi, mədəni əlaqələr genişlənir, türkoloqlar tərəfindən dil sahəsindəki əlaqələrə vaxtaşırı nəzər salınır və inteqrasiyaya, umumtürk dilləri arasında uyğunlaşmaya və özünəqayıdışa güclü diqqət yetirilir. Son illər türkdilli xalqların arasında yüksələn xətlə inkişaf edən iqtisadi və siyasi-mədəni əlaqələr, mənəvi yaxınlaşma ortaq türk dili ideyasının gerçəkləşməsinə təkan verən amillərdən biridir. Türkdilli xalqlarla əlaqələri genişləndirməyi zaman tələb edir. Müasir türkologiyanın qarşısında dayanan əsas vəzifələr öz inkişaf tarixində müəyyən səbəblər ucbatından bir-birindən ayrılmış və uzaq düşmüş türk xalqlarının dillərinin oxşar və fərqli cəhətləri barədə çoxlu sayda aktual mövzuların müəyyənləşdirilməsi, milli, mədəni, siyasi və ideoloji baxımdan böyük önəm daşıyacaq bu mövzular üzərində elmi araşdırmaların aparılmasına istiqamət verilməsidir.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, Azərbaycan dilçiliyi kafedrasının müdiri, professor Nizami Xudiyev çıxış edərək türkologiyanın hərtərəfli inkişafı ilə bağlı fikirlərini bölüşüblər.

Sonra konfrans öz işini 3 bölmədə-Türk dillərinin fonetik, leksik, qrammatik quruluşu və müqayisəsi, Ortaq türk dili və əlifbası, Türk dillərinin tarixi və dialektləri bölmələrində davam etdirib. Bölmə iclaslarında ümumilikdə 52 məruzə dinlənilib, müzakirə edilib, geniş fikir mübadiləsi aparılıb.

Konfransın yekun iclasında bölmə rəhbərlərinin hesabatları dinlənilib, müvafiq qərarlar qəbul edilib.

**Könül Nərimanqızı**

# Filologiya fakültəsində “Açıq qapı günü”

**Mayın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsində “Açıq qapı günü” keçirilib. Fakültənin dekanı, professor Mahirə Hüseynovanın rəhbərliyi və təşkilatçılığı ilə keçirilən tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, digər fakültələrin dekanları, media nümayəndələri, Bakı şəhəri və Bakıxətrafı orta ümumtəhsil məktəblərinin müəllimləri və buraxılış sinif şagirdləri iştirak ediblər.**



“Açıq qapı günü”ndə fakültənin nəzdində fəaliyyət göstərən Azərbaycan dilçiliyi, Azərbaycan dili və onun tədrisi metodikası, Müasir Azərbaycan dili, Azərbaycan və dünya ədəbiyyatı, Ədəbiyyat və onun tədrisi metodikası, İngilis dili, İngilis dili və onun tədrisi metodikası, Xarici dillər və onların tədrisi metodikası kafedralarının elmi-pedaqoji və metodik fəaliyyəti sərgi və videotəqdimatlarda nümayiş etdirilib.

Rektor Cəfər Cəfərov və fakültənin dekanı, professor Mahirə Hüseynova orta ümumtəhsil məktəblərinin müəllimləri və şagirdlərlə görüşüb, onlara universitetin, həmçinin Filologiya fakültəsinin uğurlarından, müqəddəs müəllim peşəsinin sirlərindən söhbət açılıb.

Fakültənin dekanı, professor M.Hüseynovanın fakültədə tədrisin keyfiyyətinin artırılması istiqamətində aparılan islahatlar, təlim prosesində innovativ metodların tətbiqi, tələbə-gənclərin təhsili ilə yanaşı, mədəni istirahətinin daim rəhbərliyin diqqət mərkəzində olması və s. barədə söhbətləri xüsusi rəğbətlə qarşılanıb.

“Açıq qapı günü” səmimi və işgüzar şəraitdə davam edib, ayrı-ayrı kafedralarda tanınmış professorlar, qabaqcıl müəllimlərlə və onların əsərləri ilə tanışlıq tədbirə toplaşan 12 orta ümumtəhsil məktəbinin müəllim və şagird kollektivinin, eyni zamanda universitetin digər fakültələrindən dəvət olunmuş qonaqlar və Filologiya fakültəsinin professor-müəllim heyəti və tələbələrin xatirində xüsusi iz buraxıb.

Sonda orta məktəb müəllimləri və şagirdlər universitet rəhbərliyi və fakültənin müəllimləri ilə xatirə şəkilləri çəkdiriblər.

**“Gənc müəllim”**

# Tvinninq layihəsi çərçivəsində avropalı ekspertlərlə görüş

Mayın 21-də “Azərbaycan ali təhsil sisteminin gücləndirilməsinə dəstək” adlı Tvinninq layihəsinin müvafiq ölkələr üzrə rəhbərləri, o cümlədən Fransanın Beynəlxalq Pedaqoji Araşdırmalar Mərkəzinin departament rəhbərinin müavini cənab Bruno Kurval, Litvanın Araşdırma və Ali Təhsilin Monitorinq və Analiz Mərkəzinin direktoru cənab Qedrüs Vilünas, Tvinninq layihəsinin müşaviri xanım Liza Baydanova və Latviyanın Akademik Məlumat Mərkəzinin direktoru xanım Baiba Ramina Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) olublar. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Fuad Tağızadə iştirak ediblər.



Qonaqları salamlayan rektor, professor Cəfər Cəfərov universitetdə həyata keçirilən islahatlar, yeniliklər, layihələr haqqında və qarşıda duran vəzifələr barəsində ətraflı məlumat verib.

Görüşdə layihənin ali təhsil müəssisələrinin inkişafında rolu və Avropa təhsil sisteminə inteqrasiya istiqamətində atılan addımlar, eləcə də qarşılıqlı əməkdaşlıq imkanları müzakirə edilib.

Qonaqlar dəvətə görə təşəkkürlərini bildirib, mövcud əlaqələrin genişləndirilməsini dəstəkləyərək, birgə əməkdaşlığın gələcək inkişafına əmin olduqlarını qeyd ediblər.

# RDHU-nun tələbələrinin yaz məktəbinin başa çatması ilə bağlı tədbir



Mayın 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Rusiya Dövlət Humanitar Universiteti (RDHU) və ADPU arasında imzalanmış çərçivə müqaviləsi əsasında RDHU-nun Beynəlxalq münasibətlər fakültəsinin tələbələrinin yaz məktəbinin başa çatması ilə bağlı tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, Tarix və coğrafiya fakültəsinin, Filologiya fakültəsinin dekanları və hər iki fakültənin yaz məktəbində dərs deyən müəllimləri iştirak ediblər. Qeyd edək ki, iki həftəlik yaz məktəbi zamanı Xarici dillər kafedrasının professor-müəllim heyəti tərəfindən rusiyalı tələbələrə müxtəlif mövzularda, o cümlədən Azərbaycan tarixi ilə bağlı mühazirələr oxunub, onlarla fakültələrdə görüşlər və konsert proqramı keçirilib, tarixi yerlərə ziyarətləri təşkil olunub. Yaz məktəbinin sonuncu günü rusiyalı tələbələr Azərbaycan Milli Kulinariya Mərkəzində olaraq milli mətbəximizlə yaxından tanış olublar.

Tədbiri giriş sözü ilə açan universitetin rektoru, professor Cəfər Cəfərov rusiyalı qonaqları salamlayıb, onların Azərbaycan xalqı, ölkəmiz, Bakı şəhəri və eləcə də ADPU ilə bağlı təəssüratları ilə maraqlanıb.

Rusiyalı tələbələr Azərbaycan xalqının mehribanlığını və qonaqpərvərliyini, həmçinin Bakının çox gözəl şəhər olduğunu xüsusi vurğulayıblar. Tələbələr Azərbaycan tarixinin, mədəniyyətinin onlar üçün maraqlı olduğunu qeyd ediblər. 2 həftəlik yaz məktəbi zamanı zəngin təəssürat aldıqlarını bildirən tələbələr yaradılan şəraitə görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər.

Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, Beynəlxalq əlaqələr üzrə prorektor Nigar Abbaszadə, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, Elmi katib, dosent İradə Qasımova, Azərbaycan tarixi kafedrasının müəllimi Nəbi Əsədov və başqaları çıxış edərək belə tədbirlərin iki universitet və ümumilikdə iki ölkə arasında mədəni əlaqələrin genişlənməsinə müsbət təsir etdiyini bildiriblər.

Sonda yaz məktəbinin iştirakçılarına sertifikatlar təqdim edilib, xatirə şəkili çəkdirilib.

# “Solğun çiçəklər” tamaşasının nümayişi



Mayın 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin (ADPK) tələbələrinin ifasında universitetdə Azərbaycan ədəbiyyatının görkəmli nümayəndələrindən biri olan Cəfər Cabbarlının “Solğun çiçəklər” əsəri əsasında hazırlanmış eyniadlı tamaşa nümayiş etdirilib. ADPU-nun rəhbərliyi, müəllim və tələbələri tamaşanı izləyiblər. Tamaşanın rejissoru Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin (ADMİU) professoru, Xalq artisti Məmməd Səfadır.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2018-ci dekabr ayının 17-də milli dramaturgiyamızın təşəkkülündə və inkişafında yeni mərhələnin başlanğıcını qoymuş Cəfər Cabbarlının 120 illik yubileyinin keçirilməsi haqqında Sərəncam imzalayıb. ADPU-da nümayiş etdirilən bu tamaşa da həmin Sərəncama uyğun olaraq keçirilib.



Qeyd edək ki, Cəfər Cabbarlının digər əsərləri kimi, “Solğun çiçəklər” əsəri də müasir dövrümüzdə aktuallığını saxlayır. Tələbələr rollarının öhdəsindən bacarıqla gəliblər. Onların yaratdıqları maraqlı və təsirli səhnələr izləyicilər tərəfindən böyük maraqla və alqışlarla qarşılanıb.

Tamaşanın nümayişindən sonra Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev rejissor Məmməd Səfaya və tələbə-gənclərə tamaşanın yüksək səviyyədə təqdimatına görə təşəkkür edib, onlara yeni-yeni yaradıcılıq uğurları arzulayıb.

# Cəlil Məmmədquluzadənin 150 illik yubileyinə həsr olunan tədbir

Mayın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) və Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun birgə təşkilatçılığı ilə universitetdə böyük yazıçı, dramaturq, publisist və ictimai xadim Cəlil Məmmədquluzadənin 150 illik yubileyinə həsr olunan tədbir keçirilib. Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.



Yubiley tədbirini giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev bu il yanvar ayının 17-də Cəlil Məmmədquluzadənin 150 illik yubileyinin qeyd edilməsi haqqında Sərəncam imzalayıb. Bu Sərəncam ölkəmizdə ədəbiyyata dövlət səviyyəsində yüksək qiymət verilməsinin bariz nümunəsidir. Sərəncamda qeyd edilir ki, 2019-cu ildə Azərbaycan ədəbiyyatının görkəmli nümayəndəsi, böyük yazıçı, dramaturq, publisist və ictimai xadim Cəlil Məmmədquluzadənin anadan olmasının 150 illiyi tamam olur.

Cəlil Məmmədquluzadə Azərbaycan ədəbiyyatının yeni mərhələyə yüksəlməsində müstəsna rol oynamış və bütöv bir ədəbi məktəb formalaşdırmış qüdrətli şəxsiyyətdir. Vətəndaş yazıçının bədii nailiyyətlərlə zəngin irsində azərbaycançılıq məfkurəsi dövrün ictimai-siyasi fikrinin aparıcı amili kimi dolğun ifadəsini tapmışdır. Sənətkar həyat həqiqətlərini, ictimai mühiti hərtərəfli əks etdirən və bədii-estetik dəyər daşıyıcısına çevrilən rəngarəng obrazlar qalereyası yaratmışdır. Ana dilinin saflığı uğrunda daim mübarizə aparmış Cəlil Məmmədquluzadənin meydana gətirdiyi qiymətli dram və nəsr əsərləri, parlaq publisistika dərin humanist məzmuna malik olub, özündə milli və ümumbəşəri dəyərlərin vəhdətini ehtiva edir. Azərbaycanda və onun hüdudlarından kənarda geniş yayılaraq milli oyanışa, yeniləşmə hərəkatına yol açan və azadlıq ideyalarının inkişafına qüvvətli təsir göstərən “Molla Nəsrəddin” jurnalı məhz Mirzə Cəlil dühasının məhsuludur.

Tədbirdə ADPU ilə AMEA-nın Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutu arasında elm və təhsilin inteqrasiyasının gücləndirilməsi, tədris prosesinin elmi-tədqiqatla əlaqələndirilməsi, AMEA və universitet arasında elmi-tədqiqat və kadr hazırlığı sahəsində əməkdaşlığın yaradılması və inkişaf etdirilməsi məqsədilə AMEA-nın Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunda ADPU-nun Filologiya fakültəsinin Azərbaycan və dünya ədəbiyyatı kafedrasının filialının yaradılması haqqında müqavilə imzalanıb. Müqaviləni ADPU-nun rektoru, professor Cəfər Cəfərov və AMEA-nın Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun direktoru, akademik İsa Həbibbəyli imzalayıblar.

Sonra Cəlil Məmmədquluzadə haqqında videoçarx nümayiş etdirilib.

Tədbirdə akademik İsa Həbibbəyli “Cəlil Məmmədquluzadə: həyatı, mühiti və yaradıcılığı” mövzusunda, professor Təyyar Salamoğlu “Qaranlıq dünya problemi və Mirzə Cəlilin nəsr qəhrəmanları” mövzusunda məruzələrlə çıxış ediblər. Böyük ədibin yaradıcılığının, sənətkarlıq xüsusiyyətlərinin, dünyagörüşünün, milli varlığımız və doğma dilimizlə bağlı fikirlərinin, ictimai-siyasi baxışlarının geniş və dərin təhlili əsasında qurulan məruzələr iştirakçılar tərəfindən böyük maraqla qarşılanıb.

Professor Tahirə Məmməd çıxış edərək tədbirin keçirilməsini yüksək qiymətləndirib.



Tədbirdə bədii hissə təqdim edilib.

Yekun sözü ilə çıxış edən Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova tədbirin keçirilməsinə görə ADPU-nun və AMEA-nın Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun rəhbərliyinə təşəkkür edib və Cəlil Məmmədquluzadə yaradıcılığının həmişə aktual olduğunu xüsusi vurğulayıb.

# Pedaqoji təcrübənin yekunlarına həsr edilmiş konfrans

Mayın 31-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2018-2019-cu tədris ilində ali təhsilin bakalavriat səviyyəsində əyani və qiyabi təhsilalma forması üzrə təhsil alan tələbələrin pedaqoji təcrübəsinin yekunlarına həsr edilmiş konfrans keçirilib. Konfransda ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdiri Rəşad Tağıyev, universitetin Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev, direktor müavini, dosent Ənvər İmanov, Təcrübə rəhbəri Qəmər Qəribova, Təcrübə Komissiyasının üzvləri, fakültə dekanları, kafedra müdirləri, fakültə üzrə tərcübə rəhbərləri, ixtisaslar üzrə metodistlər, pedaqoqlar, psixoloqlar, tələbələrin pedaqoji təcrübə keçdikləri tam orta məktəblərin direktorları, müəllimləri iştirak ediblər. Konfrans Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlayıb.



Konfransda pedaqoji təcrübədə olmuş tələbələrin “Pedaqoji təcrübədə nə gördük? Nə eşitdik? Nə etdik?”sualları əsasında debatı təşkil edilib.

ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov 2018-2019-cu tədris ilinin pedaqoji (istehsalat və çöl) təcrübəsinin nəticələri haqqında çıxış edib. Dosent E. Aslanov qeyd edib ki, ADPU üzrə 2018-2019-cu tədris ilinin pedaqoji (istehsalat və çöl) təcrübəsi 14 həftə müddətində və çoxtərəfli müqavilələrə əsasən keçirilib. Təhsil Nazirliyinin tabeliyindəki müəssisələrdə ikitərəfli müqavilə əsasında, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin məktəb və liseylərində üçtərəfli müqavilə əsasında, Bakı Şəhər İcra Hakimiyyətinin Məktəbəqədər Təhsil Müəssisələri və Uşaq Evləri İdarəsinin məktəbəqədər təhsil müəssisələrində, 2 özəl müəssisədə ikitərəfli müqavilə əsasında, filiallar üzrə 36 məktəbdə pedaqoji təcrübələri, Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin 9 müəssisəsində istehsalat təcrübələri, Abşeron, Xızı və Şirvan Milli Parklarında, Xıllı Nərə Balıqartırma, Neftçala Yod-Brom və Sənaye Məhəlləsinin zavodlarında, o cümlədən Avtomobil zavodunda çöl təcrübəsi təşkil edilib. ADPU-nun 3827 nəfər tələbəsi pedaqoji təcrübə keçib. Onlardan 2469 nəfər əyani və qiyabi təhsil alan tələbələr, 162 nəfər Davamlı təhsil və təlim şöbəsinin dinləyiciləridir. Filiallar üzrə 802 nəfər olmaqla, cəmi 3433 nəfər bakalavr və 394 nəfər magistr təcrübə keçib. Təşkilati iş səmərəli qurulub. Belə ki, ADPU üzrə Pedaqoji Təcrübə Komissiyasının yaradılması, komissiyanın müntəzəm iclaslarının keçirilməsi və müvafiq qərarların qəbul edilməsi, tələbələrə “Yaddaş kitabçası”nın və pedaqoji təcrübə gündəliyinin tərtibinə dair tövsiyələr verilməsi təcrübənin uğurlu nəticələri haqqında danışmağa imkan verir. Cari tədris ilində keçirilmiş təcrübənin sonunda hər bir təcrübəçi tələbənin istehsalat müəssisələrində hesabat-təqdimatının keçirilməsi, müvafiq olaraq hesabatın 10 balla qiymətləndirilməsi Elmi Şurada müzakirə edilərək qərarlaşdırılıb. Builki tədris ilində 70313 saat dərs yükü məktəblərdə təşkil olunan metodika dərslərinə ayrılıb. Tədris-metodiki iş pedaqoji təcrübənin yüksək səviyyədə keçirilməsinə imkan yaradıb. Tələbələr 7 semestri tamamladıqlarından gələcək semestr imtahanları barədə düşünmədən, gərginlik keçirmədən təcrübədə müəllimin əmək fəaliyyətinə tam yaxın mühitdə fəaliyyət göstəriblər. Tələbələr birinci həftədə hazırlıq işlərini görməyə, dərsləri müşahidə etmək üçün vaxt qazanıblar. Tələbələrin ardıcıl olaraq 12 sınaq dərsi keçməsi də onların ardıcıl və sistemli bacarıqlar əldə etmələrinə kömək edib. Belə ki, onlar standart dərs tiplərindən kənara çıxaraq qeyri-standart dərslərin-ekskursiya, laboratoriya, məşğələ, dəyirmi masa, debat, disput və sairənin də təşkilinə imkan əldə ediblər.

Dosent E.Aslanovun çıxışında həmçinin pedaqoji (istehsalat və çöl) təcrübələri zamanı mövcud olan çatışmazlıqlar və onların aradan qaldırılması yolları öz əksini tapıb.Çıxışının sonunda dosent E. Aslanov pedaqoji təcrübəni başa vurmuş tələbələrə uğurlar arzulayıb.

Konfransda 57 nömrəli tam orta məktəbin direktoru Gülnarə Cəfərova, 83 nömrəli məktəb-liseyin direktoru Nəbi Mahmudov, Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin Nəsimi rayon şöbəsinin Sosial yardım və sosial müavinətlər sektorunun müdiri Elşən Dadaşov, ADPU-nun elmi işçisi, Əməkdar müəllim Zülfiyyə Vəliyeva çıxış edərək universitetin tələbələrinin yüksək bilik və bacarığa, geniş dünyagörüşünə malik olduqlarını, müasir informasiya-kommunikasiya texnologiyalarını yaxşı bildiklərini vurğulayaraq qarşılıqlı faydalı əməkdaşlığa görə ADPU-nun və Bakı Şəhəri üzrə Təhsil İdarəsinin rəhbərliyinə təşəkkür ediblər.




Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdiri Rəşad Tağıyev çıxışında qeyd edib ki, ADPU bizim üçün xüsusi əhəmiyyət kəsb edən ali təhsil müəssisəsidir. Çünki bizim kadr potensialımız ADPU-da yetişir. Pedaqoji təcrübə tələbələrin bilik, bacarıq və təcrübələrinin artmasına səmərəli təsir göstərir. Pedaqoji təcrübənin təkmilləşdirilməsi olduqca vacibdir. Rəşad Tağıyev pedaqoji təcrübə keçmiş tələbələrə gələcək fəaliyyətlərində uğurlar arzulayıb.

Konfransda yekun sözü ilə çıxış edən rektor Cəfər Cəfərov bildirib ki, bu gün universitetdə xoş bir ovqat var. Tələbələrin dialoqu bizdə xoş təəssürat yaratdı. Pedaqoji təcrübə tədris prosesinin tərkib hissəsidir. 100-dən çox məktəbdən ADPU-ya pedaqoji təcrübə ilə bağlı təşəkkür məktubları ünvanlanıb. Bu, bizi çox sevindirir. Ölkənin gələcəyi təhsildən, məktəbdən, müəllimdən asılıdır. Məktəblərin müasir tələblərə uyğun fəaliyyət göstərmələri üçün yüksək səviyyəli pedaqoji kadrların olması vacibdir. ADPU müəllim hazırlığının mərkəzi hesab edilir. Siz gələcəkdə daha dinamik cəmiyyətdə yaşayacaqsınız. İnanırıq ki,siz faydalı insan, yüksəkixtisaslı mütəxəssis, ləyaqətli vətəndaş kimi yetişəcəksiniz. Yolunuz açıq, məqsədiniz aydın olsun! Bu yolda sizə uğurlar arzulayıram!

# Elmi Şuranın iclası

***Mayın 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq bildirib ki, iclasın gündəliyinə "2018-2019 tədris ilinin yaz semestrinin imtahan sessiyasına hazırlığın vəziyyəti haqqında", "Kimya və biologiya fakültəsinin fəaliyyəti haqqında və Monitorinq qrupunun arayışı" və cari məsələlər daxildir.***

Rektor Cəfər Cəfərov çıxışında qeyd edib ki, ötən müddət ərzində ADPU-da çoxsaylı tədbirlər həyata keçirilib. Universitetdə 2018-2019-cu tədris ilinin yaz semestrinin imtahan sessiyasına hazırlığın vəziyyəti ilə bağlı geniş tərkibdə iclas keçirilib. Bütün struktur rəhbərlərinin iştirakı ilə yaz semestrinin imtahan sessiyasının mütəşəkkil, şəffaf və ədalətli keçirilməsi üçün səmərəli müzakirələr aparılıb, qarşıda duran vəzifələr müəyyən edilib. "Elektron Universitet" layihəsinin uğurla həyata keçirilməsi üçün məqsədyönlü iş aparılıb. 2018-2019-cu tədris ilinin pedaqoji və istehsalat təcrübəsi başa çatıb. ADPU-da SABAH qruplarında 2 ixtisas üzrə tədris həyata keçirilirdi. Artıq universitetdə SABAH qruplarında 4 ixtisas üzrə tədris aparılacaq. Bu il ADPU-ya qəbul planı da artırılıb. Tədris proqramları təkmilləşdirilir, beynəlxalq əlaqələrin genişləndirilməsi üçün mühüm tədbirlər gerçəkləşdirilir. Bütün bunlar ADPU-nun cəmiyyətdə nüfuzunun yüksəldilməsinə xidmət edir.

Rektor çıxışında ADPU-ya yeni təyin edilmiş Ümumi işlər üzrə prorektor Tural Cəlilovu Elmi Şura üzvlərinə təqdim edib, həmçinin bildirib ki, Ümid Mehdiyev universitetdə rektorun müşaviri kimi fəaliyyət göstərəcək.

Iclasda Kimya və biologiya fakültəsinin İnsan və heyvan fiziologiyası kafedrasının müdiri, dosent Nizam Mehdizadəyə universitetdə uzun illər elmi-pedaqoji fəaliyyəti və 70 illik yubileyi münasibətilə Fəxri Fərman təqdim edilib.

"2018-2019-cu tədris ilinin yaz semestrinin imtahan sessiyasına hazırlığın vəziyyəti haqqında" Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov çıxış edib. Dosent E.Aslanov bildirib ki, yaz semestrinin imtahan sessiyasında ümumilikdə filiallarla birlikdə 17500 nəfərdən çox təhsilalan imtahan verəcək. 2500 nəfərdən çox təhsilalan Yekun Dövlət Buraxılış Attestasiyasından keçəcək. Bu prosesə 2000 nəfərədək akademik və inzibati heyət cəlb olunub. Yaz semestrinin imtahan sessiyası iyun ayının 3-dən iyul ayının 1-dək davam edəcək. İyunun 17-dən iyunun 30-dək Yekun Buraxılış Dövlət Attestasiyası keçiriləcək.Təkrar imtahanlar 1-3 iyulda keçiriləcək. Dərslər öncədən müəyyən edilmiş qrafikə uyğun aparılıb və dərs cədvəlinin kobud pozulması halına rast gəlinməyib. İmtahanlar ali təhsilin bakalavriat səviyyəsində I-III tədris ilinin tələbələri üçün yazılı formada, qiyabi təhsilalma formasında və əvvəlki illərdən olan tələbələr üçün isə spesifik fənlər istisna olmaqla, kompüter vasitəsilə, test üsulu formasında, magistratura səviyyəsində isə yazılı şəkildə keçiriləcək. Rektorun müvafiq əmrinə əsasən yaz semestrinin imtahan sessiyası Tədris Departamentinin İmtahan və monitorinq şöbəsi tərəfindən idarə olunacaq. Semestr və həmçinin dövlət imtahanlarında mütəşəkkilliyin təmin olunması məqsədiilə Tədris Departamentinin ümumi təşkilatçılığı ilə universitet üzrə 30 nəfər imtahan koordinatorundan, o cümlədən 120 nəfər nəzarətçi əməkdaşdan ibarət İmtahan İdarəetmə Qrupu yaradılıb və imtahanların təşkili və imtahanlarla əlaqəli bütün funksiyaların icra edilməsi bu qrupa həvalə edilib. Universitetdə İmtahan Qərargahı və Apelyasiya Komissiyası yaradılıb. İmtahan Qərargahı və Apelyasiya Komissiyası iyulun 5-dək fəaliyyət göstərəcək. Yaz semestrinin imtahan sessiyası mütəşəkkil, şəffaf və obyektiv keçirilməlidir.





Elmi Şura dosent E.Aslanovun hesabatını qəbul edib.

"Kimya və biologiya fakültəsinin fəaliyyəti haqqında" hesabatla çıxış edən fakültənin dekanı, dosent Elnarə Mehbalıyeva bildirib ki, fakültədə 4 kafedra, 2 elmi-tədqiqat laboratoriyası fəaliyyət göstərir: Analitik və üzvi kimya kafedrası, Ümumi kimya və kimyanın tədrisi metodikası kafedrası, Biologiya və onun tədrisi metodikası kafedrası, İnsan və heyvan fiziologiyası kafedrası və "Koordinasion birləşmələr" və "Yeni bioloji aktiv birləşmələr" elmi-tədqiqat laborotoriyaları.

Hazırda fakültənin professor-müəllim heyətinin sayı 121 nəfərdir. 34 nəfər tədris-köməkçi heyət çalışır. 9 professor, 1 elmlər doktoru, 74 fəlsəfə doktoru, 37 müəllim var. Fakültədə 3 ixtisas üzrə - "Biologiya müəllimliyi" ixtisası, "Kimya və biologiya müəllimliyi" ixtisası, "Kimya müəllimliyi" ixtisası üzrə ali təhsilin bakalavriat səviyyəsində kadr hazırlığı aparılır. "Biologiya müəllimliyi" ixtisasında 526 nəfər tələbə təhsil alır. "Biologiya müəllimliyi" ixtisasında qiyabi təhsilalma formasında 25 nəfər tələbə təhsil alır. "Kimya və biologiya müəllimliyi" ixtisasında 409 nəfər tələbə, "Kimya müəllimliyi" ixtisasında isə 333 nəfər tələbə təhsil alır.Ümumilikdə fakültədə hər üç ixtisas üzrə 1268 nəfər tələbə təhsil alır.

Fakültə tədris prosesinin normal təşkil edilməsi, ixtisas fənlərinin tədrisinin müasir tələblər səviyyəsinə yüksəldilməsi və tədris prosesinin yeni formalarının tətbiq edilməsi üçün müasir texniki avadanlıqlarla və İKT vasitələri ilə təmin edilib. Hesabat dövründə fakültədə tədrisin keyfiyyətinin yaxşılaşdırılması və onun səmərəliliyinin artırılması istiqamətində bir çox işlər görülüb. Müəllimlərin tədris, elmi-metodiki fəaliyyəti təşkil edilib, nəzarət mexanizmləri işlənib-hazırlanıb. Müasir dövrün tələbi olan fakültə-məktəb əməkdaşlığının qurulmasının və fakültənin inkişafına nail olunması istiqamətində müxtəlif layihələr həyata keçirilir. Fakültədə təlim-tərbiyə və tələbələrlə iş daim diqqət mərkəzində saxlanılır. Fakültənin təşkilatçılığı ilə universitetdə bir çox mədəni-kütləvi tədbirlər keçirilib, eyni zamanda universitetdə keçirilən bütün tədbirlərdə fakültənin əməkdaşları və tələbələri yaxından iştirak ediblər.

Kimya və biologiya fakültəsinin missiyası tələbələrə kimya, kimya və biologiya, biologiya müəllimliyi ixtisasları üzrə pedaqoji sahədə ən yaxşı təhsili və ən müasir bilikləri verərək məzunların həm ölkə daxilində, həm də beynəlxalq səviyyədə olan karyera imkanlarından faydalanmaları üçün lazımi bilik və qabiliyyətlər əldə etmələrini təmin etmək və rəqabətədavamlı təhsil bazası yaratmaqdır. Fakültənin hədəflərinə əmək bazarında tələb olunan yüksəkixtisaslı, səriştəli mütəxəssis hazırlığı, tədrisin səmərəliyini yüksəltməklə fakültəyə keyfiyyətli tələbə heyətinin cəlb edilməsi, beynəlxalq əlaqələrin inkişaf etdirilməsi, tələbələrin və professor-müəllim heyətinin mübadilə proqramlarında iştirakının təmin edilməsi, müxtəlif tədris, elmi-texniki və treninq informasiya mərkəzləri yaratmaqla, innovativ layihələri dəstəkləmək daxildir.

Dosent E.Mehbalıyeva çıxışının sonunda fakültədə tədrisin keyfiyyətinin yaxşılaşdırılması, tədris prosesinin daha çevik və səmərəli qurulması üçün təkliflər irəli sürüb.

Kimya və biologiya fakültəsində aparılmış monitorinqin nəticələri barədə Monitorinq qrupunun rəhbəri, Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov məlumat verib.

Professor Nizami Xudiyev, professor Nailə Verdizadə hesabatı müsbət qiymətləndirərək qəbul olunmasını təklif ediblər.

Elmi Şura dosent E.Mehbalıyevanın hesabatını qəbul edib.

Cari məsələlərin müzakirəsi zamanı Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov Elmi Şuranın növbəti iclasında ADPU-nun Əcnəbi tələbələrlə iş şöbəsinin hazırlıq kursunda təhsil alan əcnəbi dinləyicilərin dərsə davamiyyəti haqqında, Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov Magistratura səviyyəsi üzrə tədris planlarının təsdiqi barədə, Fəlsəfə doktoru proqramı üzrə dissertasiya mövzularının və elmi rəhbərlərin təsdiqi barədə, Kafedralar üzrə professor və dosent elmi adlarının verilməsi üçün Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyası qarşısında vəsatət qaldırılması barədə məlumat verib.

Cari məsələlər müzakirə olunub və müvafiq qərarlar qəbul edilib.

# SABAH qruplarının tələbələrinin "Sağlam təhsil" siniflərində pedaqoji təcrübəsinin yekunlarına həsr olunmuş konfrans



Mayın 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) SABAH qruplarının tələbələrinin "Sağlam təhsil" siniflərində pedaqoji təcrübəsinin yekunlarına həsr olunmuş konfrans keçirilib. Konfransda ADPU-nun rəhbərliyi, SABAH qrupları İcra Komitəsinin rəhbəri Şahin Seyidzadə, Milli Təhsil Texnologiyaları Mərkəzinin insan kapitalının idarə edilməsi üzrə koordinatoru Vüsal Qasımov, ADPU-nun Sabah qruplarının koordinatoru Lalə Mürsəlbəyova, müəllimlər və tələbələr, "Sağlam təhsil" siniflərində təhsil alan şagirdlər iştirak ediblər. SABAH qruplarının tələbələrinin "Sağlam təhsil" siniflərində təcrübəyə cəlb olunmalarının əsas məqsədi tələbələrin tədrisdənkənar fəaliyyətlərinin səmərəliliyinin təmin olunması, sərbəst tədqiqat və təqdimat bacarıqlarının inkişafı, tələbələrin nəzəri biliklərin əməli şəkildə nümayiş etdirilməsi və gələcəyin müəllimləri kimi "Sağlam təhsil" siniflərindəki təcrübəni öz gələcək fəaliyyətlərində istifadə etmələrinə şərait yaratmaqdır. Qeyd edək ki, SABAH qruplarının "İbtidai sinif müəllimliyi" ixtisasının III tədris ilində təhsil alan 29 nəfər tələbəsi "Sağlam təhsil" siniflərində təcrübəsini uğurla başa çatdırıb.



Tədbirdə öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib, SABAH qruplarının tələbələrinin "Sağlam təhsil" siniflərində pedaqoji təcrübəsi haqqında videoçarx nümayiş etdirilib.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov SABAH qruplarının tələbələrini "Sağlam təhsil" siniflərində pedaqoji təcrübələrinin başa çatması münasibətilə təbrik edib və onlara uğurlar arzulayıb. Rektor qeyd edib ki, ulu öndər Heydər Əliyev demişdir: "Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram". Müəllimlik peşəsi müqəddəs, şərəfli və eyni zamanda məsuliyyətli peşədir. Məhz yaxşı müəllimlərin sayəsində yüksək səviyyəli mütəxəssislər, layiqli vətəndaşlar yetişir.

Tədbirdə SABAH qruplarının tələbələri "Sağlam həyat tərzinin formalaşmasında məktəbin, valideynlərin və cəmiyyətin rolu", "Fəal təlimin mexanizmləri və sağlam təhsil siniflərində təlim keyfiyyətlərinin artırılmasında onun rolu", "Şagirdin kommunikasiya bacarıqları. Sağlam təhsil siniflərində şagirdlərin qrup halında çalışmaq və əməkdaşlıq bacarıqlarının inkişaf etdirilməsi" mövzularında təqdimatlarla çıxış ediblər.

SABAH qrupları İcra Komitəsinin rəhbəri Şahin Seyidzadə və Milli Təhsil Texnologiyaları Mərkəzinin insan kapitalının idarə edilməsi üzrə koordinatoru Vüsal Qasımov çıxış edərək bildiriblər ki, SABAH qruplarının fəaliyyətinin əsas istiqamətlərindən biri gələcəyin təhsilverənlərinin hərtərəfli inkişafına şərait yaratmaqdır. "Sağlam təhsil" layihəsi tələbələr üçün geniş imkanlar yaradır. Bizim onlardan böyük gözləntilərimiz var.

Sonda "Sağlam təhsil" müəllimləri, təqdimat edən tələbələr və SABAH qruplarının tələbələri mükafatlandırılıb, xatirə şəkli çəkdirilib.

**Mahirə Məhərrəmqızı,**
**Günay Ramizqızı**

# "Məndə siğar iki cahan..." Respublika elmi konfransı



Mayın 31-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) dahi Azərbaycan şairi və mütəfəkkiri İmadəddin Nəsiminin 650 illik yubileyinə həsr olunmuş "Məndə siğar iki cahan..." Respublika elmi konfransı keçirilib. Konfransda ali təhsil müəssisələrinin, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) müvafiq elmi-tədqiqat institutlarının alim-mütəxəssisləri, tanınmış ziyalılar, media nümayəndələri iştirak ediblər.

Konfransı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, bugünkü konfrans Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Azərbaycan Respublikasında 2019-cu ilin "Nəsimi ili" elan edilməsi haqqında 11 yanvar 2019-cu il tarixli Sərəncamı əsasında keçirilir. Həmin Sərəncamda qeyd edilir ki, Azərbaycan xalqının çoxəsrlik ənənələrə malik bədii və fəlsəfi fikrində dərin iz qoymuş mütəfəkkir-şair İmadəddin Nəsiminin zəngin irsi bu gün də insanların mənəvi-əxlaqi kamilləşməsində mühüm əhəmiyyətə malikdir.

Şərq xalqlarının mədəni sərvətlər xəzinəsində özünəməxsus layiqli yer tutan Nəsimi yaradıcılığı uzun illərdən bəri elmi-ədəbi fikrin diqqət mərkəzindədir. Şairin irsinin ölkəmizdə sistemli tədqiqi və təbliği ümummilli lider Heydər Əliyevin təşəbbüsü ilə Nəsiminin 600 illik yubileyinin keçirildiyi vaxta təsadüf edir. Böyük söz ustasının 600 illiyinin YUNESKO-nun görkəmli şəxsiyyətlərin və əlamətdar hadisələrin yubileyləri siyahısına daxil edildiyi və beynəlxalq miqyasda qeyd olunduğu həmin dövrdən etibarən Nəsimi ilə bağlı çox sayda araşdırmalar aparılmışdır. Qüdrətli şairin yaradıcılığının üzə çıxarılan əlyazma nüsxələri əsasında öyrənilməsi Azərbaycan dili və ədəbiyyatı tarixinin tədqiqində yeni mərhələ açmışdır. Nəsiminin əsərləri ölkəmizdə dəfələrlə işıq üzü görmüşdür. Şairin əsərləri Azərbaycan Respublikası Prezidentinin "Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında" 12 yanvar 2004-cü il tarixli Sərəncamına əsasən, kütləvi tirajla nəşr olunaraq ölkə kitabxanalarına hədiyyə edilmişdir.Ötən illər ərzində Nəsiminin xatirəsinin əbədiləşdirilməsi istiqamətində silsilə tədbirlər həyata keçirilmiş və onun ədəbiyyatda, incəsənətdə parlaq obrazı yaradılmış, eləcə də 1979-cu ildə ölkəmizin paytaxtında heykəli ucaldılmışdır.2017-ci ilin may ayında Parisdə YUNESKO-nun baş qərargahında Nəsiminin vəfatının 600 illiyi qeyd edilmiş, 2018-ci ilin sentyabr ayında ölkəmizdə ilk dəfə Nəsimi şeir, incəsənət və mənəviyyat festivalı keçirilmişdir.2019-cu ildə Nəsiminin anadan olmasının 650 illiyi tamam olur. Azərbaycanın ədəbi-mədəni fikir tarixinin bu əlamətdar hadisəsinin dövlət səviyyəsində layiqincə qeyd edilməsi məqsədi ilə Azərbaycan Respublikası Prezidentinin "Böyük Azərbaycan şairi İmadəddin Nəsiminin 650 illik yubileyinin qeyd edilməsi haqqında" 15 noyabr 2018-ci il tarixli 689 nömrəli Sərəncamı ilə Nazirlər Kabinetinə müvafiq tədbirlər planının hazırlanıb həyata keçirilməsi tapşırılmışdır.

Rektor qeyd edib ki, bu gün keçirdiyimiz konfrans universitetdə elmi-ədəbi mühitin zənginləşməsinə müsbət təsir edəcəkdir. Mütəfəkkir-şair İmadəddin Nəsimi Şərq insanının formalaşmasında mühüm rol oynamış qüdrətli sənətkarlarımızdan biridir. O, insanı kamil görmək istəyir, cəhalətin, xurafatın, nadanlığın, sosial ədalətsizliyin, zülmün, haqsızlığın, istismarın əleyhinə çıxır, dinin elmin, maarifin inkişafına yol açması üçün çalışırdı. Nəsimi irsi müasir humanitar düşüncənin tələbləri kontekstində aktualdır və milli mədəni-mənəvi dəyərlərin təbliği baxımından xüsusi əhəmiyyət kəsb edir.

AMEA-nın Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun şöbə müdiri, professor Qəzənfər Paşayev "Edamdan sonra başlanan həyat", ADPU-nun professoru Yaqub Babayev "İmadəddin Nəsimi poeziyasında dünyəvi motivlər" mövzularında məruzələrlə çıxış ediblər. Qeyd edilib ki, İmadəddin Nəsimi böyük humanist şair, insanı ilahiləşdirən, onu ucaldan bənzərsiz şeirlərin müəllifi, Azərbaycan ədəbi dilinin formalaşmasında müstəsna rol oynamış şairimizdir. Böyük şairin yaradıcılığının ideya-mövzu və bədii-estetik cəhətləri, bütövlükdə poeziyası şairi orta əsrlərin ən qüdrətli söz və fikir sərrafları ilə bir sıraya qoyur. Maraqlı və məzmunlu məruzələrdə İmadəddin Nəsiminin yaradıcılığı və fəlsəfi dünyagörüşü geniş təhlil edilib.

Bakı Musiqi Akademiyasının professoru Tərlan Quliyev və ADPU-nun dosenti Qüdrət Umudov çıxış edərək İmadəddin Nəsiminin əsərləri və fəlsəfi düşüncələri ilə bağlı fikirlərini bölüşüblər.

Sonra konfrans öz işini 3 bölmədə-İmadəddin Nəsimi irsi ədəbiyyatşünaslıq problemləri kontekstində, İmadəddin Nəsimi irsi və dilçilik problemləri, İmadəddin Nəsimi irsi və müasirlik bölmələrində davam etdirib. Bölmə iclaslarında ümumilikdə 60-dan çox məruzə dinlənilərək müzakirə olunub.

Konfransın sonunda bölmə rəhbərlərinin hesabatları dinlənilib, müzakirələr aparılıb, müvafiq qərarlar qəbul edilib.

# ADPU-nun nümayəndələri ERASMUS+ layihələri ilə bağlı tədbirdə iştirak ediblər

Mayın 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nümayəndələri ERASMUS + proqramı üzrə yerinə yetirilən layihələrlə bağlı ali təhsil müəssiələrinin təmsilıçilərinin qatıldığı tədbirdə iştirak ediblər. Tədbir Avropa Komissiyasının maliyyə dəstəyi ilə ERASMUS+ proqramı çərçivəsində həyata keçirilən ali təhsillə bağlı hazırda davam etməkdə




olan layihələr haqqında informasiyaların çatdırılması üçün məlumatlandırıcı konfrans səviyyəsində keçirilib. Xəzər Universitetində keçirilmiş konfransda ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Fuad Tağızadə və Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov iştirak ediblər.

Xəzər Universitetinin rektoru, dosent İradə Xəlilova giriş sözü ilə çıxış edərək tədbirin əhəmiyyətindən, beynəlxalq layihələrdə iştirakın universitetlərə yaratdığı imkanlardan danışıb. Eyni zamanda layihələrin hazırlanması və icrası, eləcə də qarşıya çıxan problemlərin daha tez həlli ilə bağlı tövsiyələrin və təcrübənin paylaşılması baxımından tədbirin əhəmiyyətli olduğunu vurğulayıb.

Azərbaycanın Milli ERASMUS ofisinin rəhbəri Pərviz Bağırov çıxış edərək Azərbaycanın əslində potensialının çox olduğunu, lakin layihələrin az sayda təqdim olunduğunu qeyd edib. Bildirilib ki, Avropa Komissiyası tərəfindən edilən çağırışlar zamanı daha çox layihələr təqdim etmək və qazanmaq mümkündür. Sözügedən proqramın fəaliyyət dövrünün artıq sonuncu ilinə yaxınlaşdığını da nəzərə alaraq bu ilin oktyabr ayında olacaq növbəti çağırışa indidən daha çox sayda yeni, faydalı layihə təklifləri hazırlamaq lazımdır.

Xəzər Universitetinin İnkişaf üzrə direktoru Raziyə İsayeva konfransın moderatoru kimi iştirakçıları salamlayıb və tədbirin əhəmiyyətindən danışıb. Xəzər Universitetinin hazırda davam edən 6 layihəni icra etdiyini vurğulayaraq görülmüş işlər haqqında qısa məlumat verib. Daha sonra layihə icra edən Azərbaycan universitetlərinin layihə koordinatorları təqdimatla çıxış ediblər, posterlər nümayiş etdiriblər. Digər ali məktəb nümayəndələri isə tərəfdaş olduqları layihələrin əhəmiyyətindən, indiyə qədər həyata keçirilmiş işlərdən danışıblar.

Bakı Biznes Universitetinin Layihələrin idarə olunması şöbəsinin müdiri Gülşən Bayramova ERASMUS+ proqramı çərçivəsində həyata keçirilən EQAC layihəsi haqqında geniş təqdimatla çıxış edib. Bu layihənin təmsil etdiyi universitetin koordinatorluğu ilə yerinə yetirildiyini qeyd edərək layihənin hazırlanması prosesi, görülmüş işlər, layihənin təsdiq olunmasından sonra universitetlərlə qarşılıqlı əməkdaşlıq nəticəsində əldə olunmuş nəticələrdən bəhs edib. Bildirilib ki, təmsil etdiyi universitet tərəfindən hazırda bir neçə layihə artıq təqdim edilmək üçün hazırdır.

Çıxışlardan sonra moderator iştirakçılarla fəal dialoq qurub, sual-cavab sessiyası baş tutub, təkliflər səsləndirilib. Vurğulanıb ki, əslində müxtəlif universitetlər tərəfindən həyata keçirilən layihələrin hədəfi, məqsədi son nəticədə keyfiyyətin artırılmasına xidmət edir və gələcəkdə bu cür konfransların keçirilməsi layihələrdə iştirak edən universitetlərin təcrübə mübadiləsinə müsbət töhfə verə bilər.

Qeyd edək ki, ADPU ERASMUS+ proqramı çərçivəsində iki layihənin, o cümlədən Valensiya Politexnik Universitetinin və Xəzər Universitetinin koordinatorluğu ilə həyata keçirilən PETRA ("Azərbaycan universitetlərində Təlim və Tədrisin təkmilləşdirilməsi") və Bakı Biznes Universitetinin koordinatorluğu ilə yerinə yetirilən EQAC ("Azərbaycan universitetlərində Keyfiyyətin Təminatı Mərkəzlərinin yaradılması və inkişaf etdirilməsi") layihələlərinin tərəfdaşlarındandır. Hər iki layihə çərçivəsində indiyə qədər bir sıra sənədlər hazırlanıb, yerli və xarici təlimlər keçirilib, beynəlxalq təcrübənin öyrənilməsi ilə bağlı yerli və xarici səfərlər təşkil olunub, universitet daxilində təqdimatlar, təlimlər keçirilib.

# Riyaziyyat və informatika fakültəsinin TEC-nin konfransı




Mayın 22-də Riyaziyyat və informatika fakültəsinin Tələbə Elmi Cəmiyyətinin (TEC) müasir Azərbaycanın qurucusu, xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 96-cı ilinə həsr olunan konfransı keçirilib. Konfransda fakültənin müxtəlif kafedralarından 10 nəfər müəllim, 45 nəfər tələbə, universitet TEC-nin sədri, kimya üzrə elmlər doktoru Əli Zalov, Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev və həmin şöbənin mütəxəssisi Arzu Kərimova iştirak ediblər.

Giriş sözü ilə çıxış edən Riyaziyyat və informatika fakültəsinin dekan müavini, dosent Allahverdi Cəfərov konfrans iştirakçılarına uğurlar arzulayıb və qeyd edib ki, belə elmi konfranslar tələbələrin elmi fəaliyyətə cəlb edilmələrinə müsbət təsir göstərir.

Sonra universitet TEC-nin sədri, kimya üzrə elmlər doktoru Əli Zalov, Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev, Riyazi analiz kafedrasının müdiri, professor Bəhram Əliyev, Riyaziyyat və onun tədrisi metodikası kafedrasının müdiri, professor Azadxan Adıgözəlov, Hesablama riyaziyyatı və informatika kafedrasının müdiri, dosent Rövşən Hümbətəliyev, Cəbr və həndəsə kafedrasının müdiri, dosent Zahirəli Sadıxov, Riyaziyyat və informatika fakültəsinin TEC-nin sədri, baş müəllim Sadəddin Haxıyev və tələbələr çıxış ediblər.

Qeyd edək ki, proqram əsasında keçirilən konfrans uğurla başa çatıb.

# Kimya və biologiya fakültəsində Bilik Olimpiadası

**Mayın 10-da Kimya və biologiya fakültəsinin akademik Yusif Məmmədəliyev auditoriyasında ümummilli lider Heydər Əliyevin anadan olmasının 96-cı ildönümünə həsr edilmiş Bilik Olimpiadası təşkil edilib.**

Bilik Olimpiadasını fakültənin dekanı, dosent Elnarə Mehbalıyeva giriş sözü ilə açaraq ulu öndər Heydər Əliyevin Azərbaycanın müstəqilliyi uğrunda xidmətləri, gənclərin yüksəkixtisaslı mütəxəssis kimi hazırlanmaları üçün fəaliyyət və tövsiyələri haqqında ətraflı məlumat verib, bilik yarışında iştirak edən tələbələrə uğurlar arzulayıb.



Tədbirdə iştirak edən dekan müavini, biologiya üzrə fəlsəfə doktoru Elnarə Muradova, universitet Tələbə Elmi Cəmiyyətinin (TEC) sədri, Analitik və üzvi kimya kafedrasının müdiri, kimya üzrə elmlər doktoru Əli Zalov, Biologiya və onun tədrisi metodikası kafedrasının müdiri, dosent Anaxanım Yusifova, Ümumi kimya və kimyanın tədrisi metodikası kafedrasının müdiri, kimya üzrə fəlsəfə doktoru Reyhan Ağayeva, dosentlər Vaqif Həsənov, Qaçay İsmayılov, Aysəba Məmmədova, fakültə TEC-nin sədri, dosent Rəhimə Məmmədova, dosent Kərim Quliyev, baş müəllimlər Kəmalə Əfəndiyeva, İsa Cəfərov, Şəfa Məmmədova tələbələri bilik yarışında həm dəstəkləyib, həm də onların nəticələrinin ədalətlə dəyərləndirilməsi üçün həssaslıqla fəaliyyət göstəriblər.

Ümumilikdə kimya üzrə 17 nəfər tələbə, biologiya üzrə 23 nəfər tələbə ilk yerlər uğrunda mübarizə aparıblar. Kimya üzrə I yeri Şölə Cəfərova, II yeri Şəhram Əbdülhəsənzadə, III yeri İlahə Ağamalıyeva qazanıblar. Biologiya üzrə I yeri Əzizağa Məlikov, II yeri Leyla İsayeva, III yeri Gülşən Aslanova tutublar.



Bilik Olimpiadasının qaliblərini təbrik edir, yeni qələbələr arzulayırıq.

**Rəhimə Məmmədova,**
**Kimya və biologiya fakültəsinin TEC-nin sədri, dosent**

# Tədrisdə fənlərarası inteqrasiya

Məqalədə gələcək kimya müəllimllərinin hazırlığı prosesində riyaziyyata inteqrasiya etməklə işləmək bacarığının formalaşmasının zəruriliyi işıqlandırılır.

Bu və ya digər fənlərin öyrənilməsinə tələbatın yarandığı müasir zaman müəllimlərdən yaradıcılıq, sərbəstlik, müstəqillik tələb edir. Bu gün müəllim artıq dar çərçivədə işləmək məcburiyyətində deyil. Bildiyimiz kimi, dünya təhsil sisteminin, o cümlədən Azərbaycan təhsilinin əsas məqsədi milli, bəşəri dəyərlərə malik intellektli, bu və ya digər mövzu üzərində düşünməyi, axtarmağı, tapmağı, müqayisə etməyi, nəticə çıxarmağı, hesablamağı, sübut etməyi, məqsədə çatmaq üçün daha az vaxt sərf etməyi, öyrənməyi, fənlərin vəhdətini, asılılığını, daimiliyini, inkişafını dərk edən vətənpərvər şəxsiyyətlər formalaşmaqdadır.

Buna görə də müasir təhsil və yeni kurikulum müəllimlərdən fəaliyyətlərini sinfin, şagirdin səviyyəsinə uyğun qurmağı tələb edir. Bu məqsədlə gələcəkdə orta məktəblərdə yaradıcı, zamanın tələblərinə uyğun müəllim yetişdirmək məqsədilə müəllimlik ixtisasına yiyələnən tələbələrin fəaliyyətinin təşkilində blok dərslərin, fənlərarası təlimin (FAT), intearsiyanın təşkili aktual məsələlərdəndir. Bu zərurətdən pedaqoji fakültə tələbələri fənləri daha dərindən öyrənməli, müasir informasiya və kommunikasiya texnologiyalarından istifadə üsullarını bilməlidirlər. Fənlərarası inteqrasiya bir neçə fənnin əhatə etdiyi anlayış, bilik və bacarıqların sintezi olmaqla, bir fənnə aid anlayış və metodlarla digər bir fənnin öyrənilməsini nəzərdə tutur. Axı müasir dünyada gedən sosial, mədəni, texnoloji dəyişikliklər qlobal düşüncə tərzinin əhəmiyyətini xeyli artırır.

Məlumdur ki, dünya tam və bütövdür, yəni dünyada nə varsa, bir-biri ilə qarşılıqlı əlaqədaradır. Belə ki, kimyəvi çevrilmələr, sintezlər, tənliklər, hesablamalar, asılılıqlar fizikaya, ədəbiyyata, riyaziyyata və s. inteqrasiya edilmədən yüksək səviyyədə mənimsədilə bilməz. Məhz buna görə də kimya fənn kurikulumun məzmununu hazırlayarkən fənlərarası inteqrasiya diqqət mərkəzində saxlanılmalıdır.

Axı şagird kimya fənnindən məsələ və çalışmaları həll etməyə başladığı ilk gün□dən riyazi usullardan istifadə etməyə başlayır.

Belə ki, nisbi molekul kütlələrinin hesablanmasında toplama əməlindən (Mr(CaO)=40+16=56), kütlə payının tapılmasında %-faizdən (MgO-də Mg elementinin kütlə payını tapaq: $\omega(Mg)\frac{24}{40}\cdot 100$%=60%) və s. üsullardan istifadə edir.

Lakin bəzi qarışıq məsələlər həm riyaziyyat fənnində, həm də kimyada vardır. Bu məsələlərdə əgər kimyəvi reaksiya yoxdursa, bu daha çox riyaziyyata aiddir. Əgər maddələr qarışdırılırsa, orada reaksiya gedirsə, müəllim həm kimyanı, həm də riyaziyyatı bilməlidir. Məsələn, daha çox riyazi üsul tələb edən məsələni nəzərdən keçirək:

- 360 kq 2,5 %-li nikel ərintisi hazırlamaq üçün başlanğıc iki ərintidən -2%-li və 5%-li ərintidən istifadə olunmuşdur. Başlanğıc ərintilərin hər birindən neçə kq götürülüb?

Həlli: 360 kq ərinti içərisində olan nikelin miqdarını tapaq:

100:2,5= 360:x

$$x=\frac{360\cdot 2,5}{100}=9kq$$

Birinci ərintinin içərisində olan nikelin miqdarı 0,05 x kq, ikinci ərinti içərisində olan nikel 0,02y kq olar:

{0,05x +0,02y=9    y=360-x
{x+y=360
0,05x+0,02(360-x)=9
0,05x+7,2-0,02x=9
0,03x=1,8    x=60 kq 5%Ni ərintisi
360-60=300kq 2%N:ərintisi götürmək lazımdır.

Həmin məsələni kimyanın qarışdırma qaydası ilə həll etsək, aşağıdakıları yaza bilərək:

5 → 2,5 ← 0,5    2,5+0,5=3
2 → 2,5 ← 2,5
360:3=120·0,5=60 kq 5%Ni ərintisi
360:3=120·2,5=300kq 2%Ni ərintisi

Həm kimya, həm də riyazi hesablama tələb edən məsələyə müraciət edək:

-830 q 60%-li sirkə turşusu məhlulu hazırlamaq üçün nə qədər sirkə anhidridi, 20%-li sirkə turşusu məhlulu götürmək lazımdır?

Həlli:

$$\underset{102}{\overset{X}{(CH_3CO)_2O}}+H_2O \longrightarrow \underset{2\cdot 60}{\overset{y}{2CH_3COOH}}$$

$$y=\frac{120x}{102}=\frac{20x}{17}q\ CH_3COOH$$

Məsələni 100 q 20%-li məhlula görə həll edirik,100q 20%-li məhlula düşən sirkə anhidridi x q olsa, məhlulun çəkisi (100-x) olar. Bu məhlul içərisində olan sirkə turşusunun miqdarı isə $\left(20+\frac{20x}{17}\right)q$ olar.

Bu zaman aşağıdakı tənasübü yaza bilərik:

5 : 3

$$(100+x):\left(20+\frac{20x}{17}\right)=100:60$$

$$300+3x=5\left(\frac{340+20x}{17}\right)$$

5100-51x=1700+100x
49x=3400; x=69y
Deməк 100q 20%-li məhlul üzərinə 69,4 q sirkə anhidridi tökülməlidir.

Bu halda 169,4q 60%-li məhlul alınır.

169,4q 60%-li sirkə turşusu məhlulu hazırlamaq üçün 69,4 q sirkə anhidridindən istifadə edildi.

830q 60%-li məhlul hazırlamaq üçün nə qədər sirkə anhidridi lazım olduğunu aşağıdakı tənasübdən tapırıq.

169,4:69,4=830:x ; x=340q($(CH_3CO)_2O$

830-340=490q 20%-li sirkə turşusu

Cavabın doğruluğunu yoxlayaq:

100:60=830:x; x=498 q $CH_3COOH$

490 20%-li sirkə turşusu məhlulunda olan sirkə turşusu 100:20=490:x;

x=98q $CH_3COOH$

340 q sirkə anhidridindən əmələ gələn sirkə turşusunun miqdarı

102:120=340:$x_1$;    $x_1$=400

$x_1$+x=498 və ya 98+400=498

Daha bir qarışıq məsələyə baxaq:

Tutaq ki, 0,04 mol $CaCO_3$ (və ya 0,04·100=4q) və 0,02 mol $MgCO_3$ (0,02·84=1,68q) götürülüb.

Birinci duzdan əmələ gələn (xlorid turşusu ilə təsir etdikdə) $CO_2$-in n.ş-də tutduğu həcmi tapaq:

$$\underset{100}{\overset{q}{CaCO_3}}+2HCl \longrightarrow CaCl_2+H_2O+\underset{22,4l}{\overset{x}{CO_2}}$$    x=0,896l

Ikinci duzdan əmələ gələn $CO_2$-in n.ş-də həcmini tapaq:

$$\underset{84}{\overset{1,68}{MgCO_3}}+2HCl \longrightarrow MgCl_2+H_2O+\underset{22,4l}{\overset{x}{CO_2}}$$

Hər iki duzun miqdarı 1,68+4=5,68q

Hər iki duzdan əmələ gələn $CO_2$-in həcmi 0,448+0,896=1,344 l

Məsələni belə də yazarıq:

5,68q $CaCO_3$ və $MgCO_3$ qarışığına xlorid turşusu ilə təsir etdikdə n.ş-də 1,344 l $CO_2$ əmələ gəlmişdir.

Hər bir duzdan neçə qram götürülüb?

Həlli:

$CO_2$-in neçə mol olduğunu tapırıq:
1,344:22,4l =0,06 mol
Bu halda duzlar qarışığı da 0,06 mol olacaq.
Birinci duzun mol miqdarı x, ikinci duzun mol miqdarı isə (0,06-x) mol olar.
Bunlara əsasən aşağıdakı tənliyi yazırıq.
100x+84(0,06-x)=5,68
100x-84x=5,68-5,04
16x=0,64
x=0,04 mol $CaCO_3$    100·0,04=4q
5,68-4=1,68q $MgCO_3$ və ya 84·0,02=1,68q

Göründüyü kimi, götürülən bu və ya digər məsələlərin həllində riyazi üsullar□dan istifadə etməmək mümkün deyil.

Bu tip kimyəvi məsələlərin sayını istənilən qədər artıra bilərik. Lakin, əsas məqsəd odur ki, hər bir gələcək kimya müəllimi fənlərarası təlimə, inteqrasiyaya yer vermədən keyfiyyətli dərs mənimsədə bilməz. Belə dərslərin fərqli cəhəti odur ki:

a) bir dərsdə müxtəlif dərslərdən istifadə etməklə tədris edən müəllim işin təşkilində digər fənn müəllimləri ilə pedaqoji əməkdaşlıq etməyi əldə edir, axtarır, öz üzərində daim işləyir, prosesdə öyrənməyi öyrənir.

b) X-XI siniflərdə "FAT" dərslər şafirdlərin iştirakı ilə də aparıla bilər.

c) "FAT" dərsləri aparan müəllim əlaqə yaratmaq üçün fənləri mükəmməl bilməlidir.

ç) Bu dərslərin tətbiqi zamanı şagirdlərin öyrənmək imkanı daha da artır. Öyrənmə prosesində məhdudluq aradan qalxır.

d) Bu dərslərdə şagirdlərin və ya tələbələrin fəaliyyəti ön plana çəkilir, onlar subyektə çevrilir, müstəqilləşirlər.

**Nazəni Novruzova,**
**kimya üzrə fəlsəfə doktoru, dosent**

**Redaktor:** Günay BAĞIRLI

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 1897
Sayı: 1500
Çapa imzalanıb: 31.05.2019-cu il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, "Azərbaycan" Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.